**SƏMƏD VURĞUN**

# SEÇİLMİŞ ƏSƏRLƏRİ

**BEŞ CİLDDƏ**

**I CİLD**

"ŞƏRQ-QƏRB"
BAKI-2005

*Bu kitab "**Səməd Vurğun.** Əsərləri. Yeddi cilddə. I cild"*
(*Bakı, Elm, 1985*) *nəşri əsasında təkrar nəşrə hazırlanmışdır*


Tərtib edəni: **Aslan Salmansoy**

Redaktoru: **Aybəniz Vurğunqızı**

**894.361 - dc 21**
**AZE**
**Səməd Vurğun. Seçilmiş əsərləri.** Beş cilddə. I cild. Bakı, "Şərq-Qərb", 2005, 264 səh.


Dədə Qorquddan gəlib Qurbanidən, Aşıq Abbasdan, Sarı Aşıqdan, Aşıq Ələsgərdən keçən yolun böyük bir zirvəsi xalq şairi Səməd Vurğundur. O, elə xoşbəxt sənətkarlardandır ki, ömrü yaratdığı şeir, həyatı danışdığı dil qədər yaşarıdır.

Səməd Vurğun Vətənin və poeziyanın yaddaşında təkrarsız poetik şəxsiyyət, milli və beynəlmiləl ictimai xadim, elm və sənət təşkilatçısı, qeyri-adi şair, dramaturq, mütərcim və mütəfəkkir kimi yaşayır.

Xalq ədəbiyyatı ilə yazılı ədəbiyyatın bizə yaxın ən böyük körpüsü sayılan ölməz sənətkar əsasən heca vəznində yazdığı şeirləri və dram əsərləri ilə dilimizin bütün zənginliyindən və şirinliyindən bəhrələnərək dillər əzbəri olan poeziya örnəkləri yaratmışdır. "Azərbaycan"ı yurdumuzun poetik tərənnümünə çevrilən ustad sənətkarın xalq şeri səpkisində yazdığı qoşmaları, əruz vəznində lirik qəzəlləri, ictimai-siyasi və fəlsəfi mövzulu bir çox şeirləri ədəbiyyatımızın qızıl fonduna daxil olmuşdur.

Səməd Vurğunun "Seçilmiş əsərləri"nin bu cildində qüdrətli şairin 1924-1937-ci illərdə yazdığı şeirlər toplanmışdır.


**ISBN 9952-418-44-X**



Azərbaycan Respublikasının Prezidenti
İLHAM ƏLİYEVİN
**“Azərbaycan dilində latın qrafikası ilə kütləvi nəşrlərin həyata keçirilməsi haqqında”**
12 yanvar 2004-cü il tarixli sərəncamı ilə nəşr olunur və ölkə kitabxanalarına hədiyyə edilir



# AZƏRBAYCAN ƏDƏBİYYATININ VURĞUN DÖVRÜ

*Məni yelkən kimi qərq etsə də dəryada zaman,*
*Vurğun öldü deməyin, bir əbədi sənəti var...*

***Səməd Vurğun***

Azərbaycan ədəbiyyatı tarixində "sovet epoxası" deyilən dövrün böyük poeziyasını yaradanların sırasında Səməd Vurğunun adı xüsusi ehtiramla çəkilir. O, Vətənin və poeziyanın yaddaşında təkrarsız poetik şəxsiyyət, milli və beynəlmiləl ictimai xadim, elm və sənət təşkilatçısı, qeyri-adi şair, dramaturq, mütərcim və mütəfəkkir kimi yaşayır.

Səməd Vurğun (Səməd Yusif oğlu Vəkilov, 21 mart 1906 – 27 may 1956) təkcə şerimizin yox, təbiətimizin də milli timsalı idi. "Muğan" poemasını, ceyran obrazını o, təbiət-şəhər müxalifətində ikincinin hələ "kult" təşkil etdiyi dövrdə yaratmışdı. Folkloru və sazı, qopuzu və ozanı, təbiəti və dağları xatırladan kolorit və əda onun həm şəxsiyyətini, həm də poeziyasını eyni vaxtda ifadə edirdi.

Səməd Vurğun həmişə tribunaya da qartal kimi sinə gərərdi və bu tribuna nə qədər uca olsaydı, Vurğun ona bir o qədər yaraşardı. Ov dalınca çıxdığı qaya başından təbiətə boylanarkən bütünlüklə zirvələr, dağlar Vurğun ilhamının şaha qalxdığı, at oynatdığı oylaq və meydan üçün vüsət və ucalıq ölçüsü yox idi. Şair kosmosun fəthi dövrünü görsəydi, ayrı heç nəyi yox, məhz kosmik peyki planetə müraciət etmək üçün ən münasib tribuna adlandırardı və həmişə olduğu kimi, Vurğun monoloqu belə bir tribunaya yenə də yaraşardı!

Şübhəsiz, Vurğun üçün ən böyük tribuna, kosmik orbitdən də uca xitabət kürsüsü isə poeziya idi. Məhz bu tribunadan şair bütün planeti görür və bütün planetdən görünürdü. Lakin daha mənalı olan odur ki, dünya və planet auditoriyasına da o, həmişə "Azərbaycan" monoloqu ilə müraciət edirdi. Vətəndaş və vətənpərvər şair üçün ana Vətənin adından uca poetik xitab yox idi.

Bir sözlə, bütün dünya bu poeziyada öz əksini tapırdı. Lakin dünyanın da mərkəzi bu poeziyada – Azərbaycan idi!

Bir metafora kimi Azərbaycan o illərdə ən iri, ən möhtəşəm bədii əksini bu şeirdə tapmışdı. "Ayrılarmı könül candan, Azərbaycan, Azərbaycan" – dillər əzbəri bir beyt bu gün də Vətənə məhəbbət etirafının riyazi düsturu olaraq qalır – "Könül və can" bərabərdir. "Vurğun və Azərbaycan" – milli bədii fikirdə son yüzilin ən klassik poeziya tənliyi ilə, şeirdə "Vurğun arifmetikası"

isə belə idi! Və həmin tənliyin ən klassik həllini də öz poeziyasında Vurğun özü vermişdi.

Könül və can kimi, Vurğun və Azərbaycan da bir-birindən ayrılmaz idi: "Ayrılarmı könül candan?" – bu, kiməsə, yaxud nəyəsə yönələn ritorik sual deyil, şairlə vətən arasında "elani-eşq" və "əhdi-peyman" idi. Təsadüfi deyil ki, bir bədii metafora kimi Azərbaycan Vurğuna qədər hələ heç bir şeirdə bu qədər bütöv, bu qədər tam olmamışdı. Heç nə bu rəmzi əbədi, mənəvi vəhdəti parçalamağa qadir deyildi.

Səməd Vurğunun qartal kimi sinə gərdiyi, səmasında pərvaz etdiyi ən uca tribunaların biri – Yazıçılar İttifaqının ikinci qurultayının xitabət kürsüsü oldu. Səməd Vurğun həmin kürsüdən sovet poeziyasını uçmağa hazırlaşan qartala bənzədir və bu sözləri deyərkən kürsüyə sinə gərmiş şairin özü işlətdiyi obrazın əyani heykəlinə çevrilirdi. Vurğun bu qartalı daha da uzaqlara, romantik zirvələrə səsləyirdi. Ümumiyyətlə o, romantikadan həmişə romantik bir ehtirasla danışırdı. Bütün sovet ədəbiyyatında M.Qorkidən sonra romantikanın böyük bayraqdarı Səməd Vurğun idi!

Poeziyanın "Vurğunlu tribuna" obrazına üçüncü bir xitabət kürsüsünü də əlavə etmək olar: şair "Ölüm kürsüsü" əsərində bolqar öndəri Dimitrovu, "Zəncinin arzuları"nda isə rəssam zəncini xitabət və ittiham kürsüsündə təsvir edir.

Nəhayət, onun özünün Londondakı ziyafət kürsüsündən dünyaya yayılan gur səsi, romantik portreti realist bir qələmlə şeirdə həkk olundu. K.Simonovun "Dostum Səməd Vurğunun Londondakı ziyafətdə nitqi" adlı məşhur şeri "Vurğunlu tribuna" obrazını rus poeziyasında da yaratdı.

Bu yüksək tribunadan o, uca fikirlər, işıqlı, qanadlı ideallar təbliğ və tərənnüm edirdi. Lakin "sovet poeziyasının problemlərini" şair yalnız yüksək xitabət kürsülərindən söylədiyi elmi-nəzəri çıxışlarda həll etmirdi. Vurğun ilhamının ən uca orbiti poeziyanın səması idi: o, hələ "Muğan" poeması ilə özündən sonrakı poetik perspektivin – Tvardovskinin və Yeqor İsayevin gələcək epik axtarışlarının – "Üfüqlərdən üfüqlərə" və "Yaddaşın məhkəməsi" üslubunun ilk özül daşlarını qoyur. Elmi-texniki inqilabın təbiət əleyhinə çevrilən nəticələrinə qarşı poeziyanın böyük üsyanını elan edir. XX yüzilin təbiəti müdafiə salnaməsinin ilk səhifəsinə məhz Səməd Vurğunun "Muğan" poemasındakı ceyranın emblemini həkk etmək lazımdır.

Daha sonrakı poemasında – "Zamanın bayraqdarı"nda Səməd Vurğun sovet hakimiyyəti dövründə həqiqi istedadın həmişə qarşılaşdığı böyük bədii çətinliyi yenidən və uğurla həll edir: mühüm ideoloji sosial-tarixi mövzunun konyunktur çərçivədə "adi siyasi təfsir"ini yox, əsl fəlsəfə və poeziya səviyyəsində həllini verir. Repressiya dövrünün ən sərbəst sualı o illərdə Vurğun poeziyasından eşidilir: "Qalib gələcəkmi cahanda kamal!". Həm qədim inti-

bahın, həm də bizimlə çağdaş illərin bu Hamlet sualını o, "İnsan" dramında əsl bir Tolstoy vüsəti ilə XX yüzilin "Hərb və sülh"ü barədə bədii və fəlsəfi düşüncələr əzəməti ilə yenidən, özü də hamıdan əvvəl irəli sürür! Bu gün həmin mövzu xüsusilə aktual səslənsə də, sonrakı ikinci "İnsan"ı səhnəmiz və poeziyamız hələ də gözləməkdədir.

Səməd Vurğunun poeziyası da, bioqrafiyası da bilavasitə xalqın tarixinin və taleyinin iradəsidir. Onun gəncliyi müsibətdə, ölüm və qanlı keçmişindən ayrılan və əzablar içində təzədən doğulan ölkənin ilk gəncliyi ilə eyni tarixi dövrə təsadüf edir. Yeni epoxa ictimai-siyasi həyatda aprel çevrilişi ilə, çağdaş milli poeziyada isə Səməd Vurğunla və onun təmsil etdiyi ədəbi nəsillə başlayır. Şəxsiyyətinə və yaradıcılığına məxsus bədii və inqilabi miqyaslar şairin, bütünlükdə milli poeziyanın da bioqrafiyasında tarixi yerini və xidmətini müəyyənləşdirir. Nizaminin və Xaqaninin, Nəsiminin və Füzulinin, Vaqifin və Sabirin böyük varisi və xələfi rolunda indi o tayda Şəhriyar, bu tayda Vurğun çıxış edirdi!

Azərbaycan xalqının milli-ictimai düşüncə, əxlaq və mənəviyyat, bədii təfəkkür və intellekt ənənəsi XX yüzilin ortalarında öz təkrarsız əksini bu bədii-tarixi fenomendə – Səməd Vurğun poeziyasında tapır. Qanadlı və romantik bir vətəndaşlıq amalına, bədii-estetik və fəlsəfi ideala xidmətdə miqyaslı, qlobal meyarlar və hüdudlar onu yalnız böyük sələfləri ilə yox, həm də böyük müasirləri ilə müqayisə edəndə görünür.

Xüsusən, o dövrün böyük romantik ənənəsi hamıdan çox Səməd Vurğunun adı ilə bağlı idi. Füzulidən və Hafizdən, Bayrondan və Puşkindən, Əbdülhəqq Hamiddən və Namiq Kamaldan, Məhəmməd Hadidən və Hüseyn Caviddən sonra romantik poeziyada ən böyük yeri Səməd Vurğun tuturdu. Romantika ona, o, romantikaya yaraşırdı. Poetik ərşə və zirvəyə yüksəltdiyi Vaqiflə, Fərhadla, Şahbazla birlikdə o, özü də romantik ucalığı və zirvəyə yüksəlirdi.

Özünün möhtəşəm nəzəri-estetik irsində və poeziyasında Səməd Vurğun bütün sovet ədəbiyyatının, dünya və Şərq şerinin problemlərini həll edirdi. Sovet dövründə yeganə şair idi ki, xaricdəki, Londondakı çıxışına K.Simonov özü poema həsr etmişdi. Bütün keçmiş sovet məkanında poetik fikrin axtarışı, hərəkəti və perspektivliyi haqda manifesti – II Qurultayda hesabat məruzəsini ona etibar etmişdilər.

Səməd Vurğunun müharibədən sonrakı ilk epik dastanları ("Leninin kitabı", "Muğan", "Aygün", "Zamanın bayraqdarı" poemaları) xalis məndəricə, bilavasitə mövzu, obraz, ideya və fikir baxımından olmasa da, sənətkarlığın, poetikanın, bədii dil və üslubun nəzərə çarpacaq dərəcədə yeniliyi, novatorluğu baxımından həm özünün, həm də bütünlükdə poeziyanın inkişafında yeni mərhələnin əsərləri və hadisələri kimi səslənirdi. Növbəti mərhələ –

altmışıncı illər – bir də məhz bədii poetikada, sənətkarlıqda bu nümunələrin imkanları zəminində formalaşa bildi.

Dövrün hakim siyasi ideya dəbinin, sosioloji ritualın onlarda bu və ya digər dərəcədə öz əksini, izini tapmasına baxmayaraq, bu əsərlər hamısı həmin illərin fitri istedad, sənətkarlıq səviyyəsinə qalxan poeziya hadisələri, şerin daha sonrakı möhtəşəm qalasının bürcünə və divarına qoyulan daşlar idi. Bu qalanın bu və ya digər divarını, bürcünü, tağını uçurmadan, onların heç birini şerimizin xarakterindən silmək, binasından qoparıb atmaq olmaz. Zamanın tarixi salnaməsi olmaqla yanaşı, onlardan hər birinin bədii möhürü və izi bugünkü tərəqqinin də sənətkarlıq uğurlarında yaşayır.

Bədii dildə, üslubda belə bir təmizlənmənin ("katarsisin"), xüsusilə qabarıq nümunəsi isə Səməd Vurğunun son fəlsəfi şeirləri idi. "Şair, nə tez qocaldın sən?!", "Gödəkçə", "Unudulmuş tək məzar", "Mən tələsmirəm" kimi nümunələr hamısı ustad şairin həsrət məqamından ("Körpünün həsrəti" şerindəki ayrılıq körpüsündən) keçdikdən sonra yazdığı nümunələr idi. Hələ "Komsomol poeması"ndan, "Zəncinin arzuları"ndan, "Ölüm kürsüsü"ndən, "Aygün"dən, "Muğan"dan formalaşan və həqiqi epizm səviyyəsinə qalxan gərgin psixoloji fabula, fikrin, dramatizmin və emosiyanın süjeti burada son həddə çatır və həmin nümunələri klassik miniatür şedevrə çevirirdi:

Sellərdən, sulardan yeyin axsam da,
Şimşəklə yanaşı göydə çaxsam da,
Nə şadlıq səyirtsin atını, nə qəm,
Heç yana, heç yerə mən tələsmirəm.

Bütün bu nümunələr hamısı birlikdə həyatın dərkində yeni imkanlar axtaran poetik təfəkkürün altmışıncı illərə doğru yolda artıq arxada qoyduğu ilk sınaqlar idi.

Hər halda gərək unutmayaq ki, hətta "Zamanın bayraqdarı"nda da bizimlə danışan, əslində poeziyanın bayraqdarıdır. Və həmin poema dövrün ədəbi zirvələrindən birini təşkil edən şeir incisi, peşəkar bədii sənət hadisəsidir. Sənət isə ideologiyadan həmişə yüksək, həmişə dərindir.

Ritorika ilə, ehkamla kəmistedadlıq həmişə bir yerdə olur. Konyunktura adətən orta intellektə yol tapır. Hakim ehkama və dəbə yalnız ortabab açıq olur. Qrafomanın özünü təsdiq edə bilməsi, irəli getməsi üçün ayrı imkan və vasitə əslində heç olmur da. Əsl istedadın (fenomenin!) qələmində isə hətta vulqar ehkamın, bolşevik ritorikanın da hədəfi və predmeti, normativ istilah sistemi, rəsmi ədəbi mədh, tərənnüm leksikonu nüvədə, alt qatda (obrazlı, fəlsəfi mənada və məzmunda!) hərfi məzmundan və sənətə yabançı tullantıdan mütləq təmizlənir, böyük sənətin hədəfinə, fitri poetik stixiyanın

predmetinə çevrilir. Məsələn, elə həmin Səməd Vurğuna məxsus istedadın, poetik təfəkkürün əsl miqyası və möhtəşəmliyi məşhur “Dünya” və “Yadıma düşdü” rədifli qoşmalarda yox, məhz “Zamanın bayraqdarı”, “Komsomol poeması”, “İstiqbal təranəsi” tipli böyük bədii strukturlarda axıra qədər gerçəkləşir və sonacan əyani görünür. Həmin əsərləri Zamanın tozlu arxivinə verməyə tələsmək lazım deyil. Əksinə, zamanın, günün tozundan yaranan pərdəni, empirik, hərfi qatı onlardakı sözlərin və sətirlərin üstündən silmək, daxildən, içdən gələn saflığı özünün təmizlədiyi “təzə” mətni yenidən oxumaq lazımdır, bu gün əcdad Nizamini, Füzulini hakim rəsmi etiketdən təmizləyərək oxuduğumuz kimi!

Nisbətən sonrakı nəsillərin bu dövrdəki yaradıcılığına gəldikdə isə, hətta onların bədii mətnlərinə münasibətdə də “toz silmə” əməliyyatına ehtiyac nisbətən az olsa da, tamam yox olmur.

Təsadüfi deyil ki, məhz sənətkarlıq xüsusiyyətlərinə görə, Azərbaycanda ilk sovet poeziya məktəbi də “Səməd Vurğun məktəbi” kimi formalaşmışdı. Məhz bu məktəbin dərsləri bu gün də milli poeziya təhsilində “ali kursları” təşkil edir. Onu ümumiyyətlə, klassik sovet şeir məktəbinin ən yaxşı ənənələrindən ayrı təsəvvür etmək mümkün deyildir. Belə ki, Səməd Vurğun hər poemasında, hər pyesində o dövrkü “sovet poeziyasının problemlərini” həll edirdi, dünya şeir hərəkatının ən mütərəqqi inqilabi meyllərini təsdiqləyir və aşkarlayırdı. Məhz onun tərənnüm etdiyi humanizm, beynəlmiləlçilik və azadlıq ideallarının əsrlərdə və qitələrdə davam edən yürüşü bu sözü indi də bir daha və ucadan deməyə haqq verir.

Səməd Vurğun böyük şair və böyük poeziya təcəssümü idi. Müasirləri üçün “Vurğun” anlayışı poeziyadan da geniş idi. Vurğunla şeir arasında təmas qarşılıqlı, ikitərəfli idi: bu təmasdan hər şey poeziyanın, poeziya isə Səməd Vurğunun səviyyəsinə qalxırdı! Vurğunun poeziyası həyat, şəxsiyyət və şeriyyət adlı üç dünyadan ibarət idi.

XX yüzilin və planetin qayğıları bu üç dünyaya sığışırdı. Vurğun ilhamının poetik məcrası, onun sənətkar marağının bədii əhatə dairəsi ən geniş fəlsəfi miqyasları, coğrafi üfüqləri birləşdirirdi.

Bütün yer üzündə – “qara qitə”də və Amerikada, Avropa və Hindistanda, Arktika buzlarında və Xəzər dalğalarında, ərəb səhrasında və Muğan düzündə, Bakıda və Təbrizdə baş verən hadisələr hamısı bu şeirdə eyni məhəbbət, nigarançılıq və hərarətlə qələmə alınırdı. Onun poetik həssaslığının səviyyəsi dünənlə sabah, bu günlə keçmiş arasındakı yollarda da dəyişməz qalırdı; ulu əcdadı Nizaminin orta əsrlərdən qalan ən qədim əlyazması da onun yazı stolunda eyni bir nəfəsin hərarəti ilə isinirdi. Ənənə ilə yeniliyin, millilikl̇ə böyük miqyasda vətəndaşlığın məhz belə bir qaynağı

və vəhdəti ona müasirliyin beynəlmiləlçi bir şairi və mütəfəkkiri kimi ittifaq və dünya şöhrəti qazandırdı.

Şübhəsiz ki, o, hər şeydən əvvəl Azərbaycan xalqının öz milli qəhrəmanlıq keçmişinin və ağrılı, dramatik bu gününün nəğməkarı idi.

Hər şerində Vurğun – eyni vaxtda üç qatda, Azərbaycan, Dünya və Tarix adlı üç məkanda yaşayan filosofdur. Onu bu və ya digər məhdud zamanın konyunktur, ibtidai, merkantilist süzgəcinə salıb, ona orada qiymət vermək ən böyük məhdudluq olardı. Sözlərin, sətirlərin adi mənası bu obrazın ancaq görünən qatı, səthi və zahiri tərəfidir.

Səməd Vurğunda nisbi həqiqətlərin hər birindən qlobal həqiqətlər görünür. Bədii düşüncədə ən vulqar, ehkamçı, unitar dövrün ən sərbəst fəlsəfi sualını poeziyada Səməd Vurğun verib: "Qalib gələcəkmi cahanda kamal!", zorakılıq, repressiya, "kazarma sosializmi" deyilən dövrün, kamalın – yəni marksizmin qəti qələbəsi sayılan epoxanın Hamlet sualı, Tolstoy "Hərb və sülh"ü, həm bəşəri, həm də ilahi komediyası "İnsan" faciəsi idi. Zamana Gete və Faust xitabını da yeni şeirdə məhz Vurğunun dilindən eşidirik:

Bu dünyaya neçə dəfə keçib sonradan,
Öz əlimlə uzadaydım günün ömrünü.

O, yer kürəsinə sığmırdı, "sovet ideologiyasına" necə sığa bilərdi? Sonsuzluğa, intəhasızlığa sığmırdı, "bolşevik sxolastikaya" necə sığa bilərdi?

Şair cahana sığmayan ruhunu, sərhədsiz düşüncəsini sıxdığı üçün zamana üsyan edir, faniliyi və müstəqilliyi üçün vaxtın (!) özünü qınayır:

Uzadaq ömrünü hər bir anın da
Yel kimi ötməsin vaxt üstümüzdən!

Yaxud:

Bulud tez keçməsin başımın üstdən,
Çay da yavaş axsın sular boyunca.
Qoy dünya böyüsün, zaman uzansın,
Bir günün ərzində aylarla yansın
Al günəş gözündən nur yağa-yağa.
Ömrün kitabını tamamlamağa
Çox da can atmasın əlimdə qələm.
Bu saat, bu dəm
Heç yana, heç yerə mən tələsmirəm.

Təkcə tələsən vaxtı yox, hətta tələsən fırçanı, qələmi təhdid edir:

Ömrün kitabını tamamlamağa
Çox da tələsməsin əlimdə qələm.

Nəhayət, bütün tələsənləri, dünyaya bütün kəmfürsət və kəmhövsələ baxanları giley hədəfi edir:

...Qoy uzansın gecə, geciksin səhər,
...Bu saat, bu dəm
Heç yerə, heç yana mən tələsmirəm.

Tamlığa, sonsuzluğa o, yalnız ömür adlı zamanda yox, həm də "Azərbaycan" adlı məkanda, Vətəndə nail olub.

Ən mükəmməl "Azərbaycannamə" – 40-60-cı illər şerində hamıdan çox Vurğunun poeziyasıdır. Könül və can kimi Vurğun və Azərbaycan da bu şeirdə bir yerdədir: "Ayrılarmı könül candan, Azərbaycan, Azərbaycan". Onu bir şair, bir oğul kimi yaradan Azərbaycanı o, şeirdə yenidən yaradır. Milli himn şəklində, "Muğan" şəklində, "Bakının dastanı", "Aslan qayası" şəklində, hətta "Lökbatan" şəklində! Muğanın, Bakının, Lökbatanın ikinci dastanı bu tamlıqda, bu möhtəşəmliklə daha heç kəsdə yoxdur.

Digər tərəfdən, Azərbaycanın şeir dilini Vurğun yenidən yaradır. Bu tamlıqda, duruluqda, saflıq və gözəllikdə Azərbaycan türk şeir dili o illər hamıdan çox Vurğuna xas idi.

Nəhayət, Azərbaycanın qəhrəmanlıq keçmişinin ruh və yaddaş tarixinin şeirdə ən mükəmməl salnaməsini o illər yenə hamıdan kamil məhz Səməd Vurğun yaradır: Zərdüştün, Hürmüzün, Şirinin, Fərhadın, Vaqifin, Söhbətin, Şahbazın obrazları səhnədən bizim tarixə məhz Vurğunun dili və sözü ilə daxil olur.

Sovet dövrü ədəbiyyatında həqiqi milli xarakterin, realist zadəgan-kübar (mülkədar) obrazının ilk tutumlu nümunəsi sayılan Cahandar ağanın da (İsmayıl Şıxlı, "Dəli Kür") daha qədim, ilkin Gəray bəy mənşəyini Səməd Vurğunda tapmaq olar. Poemada ("Komsomol" poeması) romantik Cəlal şərəfsiz və qəddar Kəbleyinin qurşun yağmuruna hədəf olur, amma Gəray bəyin özünü Səməd Vurğun "Komsomol qurşunu" ilə öldürmür: onu Humayın teyfi Kürdə qərq edir. Bu, Gəray bəyin hətta ölümünə şairin rəğbətinin ifadəsi idi.

* * *

Səməd Vurğunun adı, şəxsiyyəti, milli, poetik “mən”i ilə ən çox bağlı əsər “Vaqif”dir.

Tarixən Vaqifin həm də dövlət xadimi kimi Azərbaycan ədəbi-ictimai fikrinin inkişafında görkəmli xidmətləri olmuşdur. Şair Vaqif poeziyada realist xəlqiliyin, milli-etnoqrafik koloritin və xalis dünyəvi nikbinlik fəlsəfəsinin bərqərar olmasında müstəsna rol oynamışdır. Qarabağ xanlığının vəziri, ayıq və müdrik dövlət xadimi, alim, Zaqafqaziya xalqlarının dostluğunun carçısı və Avropaya rəğbətin ilk tərəfdarlarından biri kimi də Vaqifin tarixi siması işıqlı və cazibədardır. Bütün bu keyfiyyətlər ümumiləşdirilmiş və Səməd Vurğun Azərbaycan sovet dramaturgiyasında Xəyyamdan sonra ikinci böyük şairin romantik bədii obrazını yaratmışdır.

Süjetin mərkəzində qüvvətli şəxsiyyətin durmasına baxmayaraq, hadisələr miqyaslı xalq dramı və sosial dram məcrasında cərəyan edir. Pyes boyu sanki güclü yeraltı təkanın uğultusu kəsilmir, uzun-uzun illər feodal hakimlərin zülm etdiyi məzlum təbəqələrin səbr kasasının daşacağı anı tamaşaçı intizarla gözləyir. Lakin “Vaqif” – həm də şair və onun taleyi barədə dramdır. Pyesdə “şairin taleyi”– elin taleyinə qaynayıb qarışır. Vurğunun Vaqifi xalqa, elə arxalanır, onun qəhrəman, zəhmətkeş və sənətkar oğullarına qarşı təşkil edilən və planlı şəkildə idarə olunan hakim zorakılıqla barışmır, təkcə öz mövcudluğu ilə hər cür fiziki və mənəvi müstəbidliyə müqavimət göstərir. Müstəbid və ziyalı problemi həm Vaqif – İbrahim xan, həm də Vaqif – Qacar xətlərində qoşa davam etdirilir. Bu xətlərin hər ikisində tarixi təfərrüatla yanaşı müasir, fərdi-avtobioqrafik məqamlara da aşkar işarələr var. Nəzərə alsaq ki, “Vaqif” 1937-ci ildə yazılıb və 1938-ci ilin 5 oktyabrında tamaşaya qoyulub, onda burada təsvir olunan XVIII əsr hadisələrində 1937-ci ilin “podteksti”ni də tanımaq çətin olmaz.

“Xanlar” (1939) dramında şair artıq yaxın keçmiş – Bakı proletariatının tarixi-inqilabi mübarizəsi mövzusuna müraciət edir və məşhur inqilabçı Xanlar Səfərəliyevin surətini yaradır. XVIII əsrin şairi və cəngavəri kimi, XX yüzilliyin Bakı fəhləsi də əslində, mahiyyətcə geniş xalq kütləsinin milli-mənəvi və ictimai mənafeyinin təmsilçisi olaraq qalır. Lakin hadisələrin bədii rəsmində, üsyana qalxan xalqın taleyi və mübarizəsinin bolşeviklər partiyasının inqilabi fəaliyyəti ilə sıx əlaqədə təsviri, xüsusən Koba surətinin ideya şərhində şəxsiyyətə pərəstiş kultunun o illərə xas ədəbi stereotipləri də aşkar şəkildə özünü göstərir. “Xanlar” – tarixi koloritli, obrazlı-fəlsəfi miqyası ilə “Vaqif” səviyyəsinə qalxmasa da, tarixi-inqilabi mövzunun romantik-epik həlli istiqamətində dövrün axtarışlarını əks etdirən orijinal bir nümunə kimi əhəmiyyətini qoruyub saxlayır.

Digər tərəfdən, “Xanlar”ı “Vaqif”lə və bütünlükdə Vurğunla birləşdirən əsas tel burada Xanlar deyil, bəlkə doktor Söhbətdir. Şairin əbədi-əzəli əxlaq, vicdan idealı və mövqeyi burada məhz onun simasında öz davamını və inkişafını tapır:

Yoxdur məsləkində nə ölüm, nə qan,
Vicdan düzəldəcək həyatı, vicdan!..

“Xanlar”ın bir fəlsəfi-ideya dramı kimi ən güclü cəhəti – Söhbətlə, ən zəif cəhəti – Şaumyanla, Koba ilə, Vanya ilə bağlı cəhətlərdir. Onların adları kimi, özləri də əsərdə yad səslər, xarici notlardır.

“Vaqif”də Vidadi Tanrıya üsyan etdiyi kimi, “Xanlar”da da Söhbət Vətənə xitab və etirafını bildirir:

Əgər gec tapdımsa haqqın yolunu,
Bağışla, ey Vətən, şair oğlunu!

Vidadi nahaqqa üsyan və etiraz kimi, bir anlığa Tanrıdan “üz döndərməkdə” nə qədər haqlı idisə, Söhbət də mənəvi-milli dəyərlərdən üz çevirməkdə, bolşevik qan və sinif təliminə iman gətirməkdə bir o qədər haqlı idi.

Lakin şair özü kommunist dünyagörüşü üçün “bağışla, vətən” etirafı ilə xalqa xitab etməyib. Bu, doğru da olmazdı. Kommunizmin ideologiyasının mədhi altında öz ənənəvi-milli fəlsəfi kredosunu Vurğun alt qatda həmişə qoruyub saxlayırdı.

Eyni sözləri “İnsan” dramı və Şahbaz obrazı barədə demək olar. “İnsan”da Hürmüz-Əhrimən, xeyir-şər, Odisseya, Faust, Hamlet sualı və fəlsəfəsi ilə bağlı əbədi düşüncə davam edir. Əql (Şahbaz), Qılınc (İslam), Əxlaq (Səhər) üçlüyü hətta Şərq irfan və təsəvvüf idealını yada salır.

“İnsan” haqqında ədəbi tənqidin səhifələrində “Qalib gələcəkmi cahanda kamal?” – sualını primitiv sayıb, Şahbazı isə fəlsəfə maraqlısı sayanlar da, onu XX yüzilliyin Habili, Faustu, Hamleti hesab edənlər də olub. Şübhəsiz, həqiqətə ikincilər daha yaxın olub.

Əsər – müharibədən otuz il sonranın təsviri ilə bitir – beynəlmiləl, ideal “Qardaşlıq şəhəri”nin! Otuz yox, altmış il keçib, amma şair xəyalının utopik şəhər axtardığı eyni ərazidə, coğrafi məkanda bu gün biz məhz “qardaşlıq şəhərinə” parodiya olan “işğal şəhərlərini” görürük. Elə bu gerçəklik özü “Qalib gələcəkmi cahanda kamal?” sualına həyatın özündəki bir cavabdır.

“Fərhad və Şirin” (1941) dramatik poeması isə Səməd Vurğun sənətinin şəksiz uğurları sırasına daxildir. 1941-1945-ci illər müharibəsinin ən ağır, dramatik bir çağında şair sanki həm məzmun, həm də tarixcə zamandan uzaq

bir keçmişə müraciət edir, lakin müasir və aktual, romantik və vətənpərvər bir əsər yaradır. Şərq şerinin klassik eşq dastanına müəllif yeni məna verir və bu zaman süni, zahiri, modern ifratlardan tamamilə yan keçə bilir.

Səməd Vurğun məhəbbət süjetinin əxlaqi mahiyyətini ön plana çəkərək, müasir bir sosial-vətənpərvərlik istiqaməti aşılayır. Fərhad – qüdrətli daşyonan-memardır. Vətənə, xalqa məhəbbəti yolunda çapa bilməyəcəyi qaya və dağ yoxdur. Eyni qayaları Fərhad külüngü, Azər baba isə müdrikliyi ilə fəth edə bilir və bu iki silahın hər ikisi torpağın, Vətənin ağır günündə xalqa eyni dərəcədə lazım olur. Səməd Vurğun Şirin naminə eşq rəqabətinin də mənasına yeni sosial çalar artırır. Şirini sevən Xosrov qanlı bir fateh, müstəbid və tirandır. Fərhadın qoruduğu qala isə Vətənin namusunu yad əllərdən və nəfəsdən qoruyan bir məhəbbətdir. Vətən qızı Şirinin də məhəbbətində ikilik yoxdur. Onun Xosrova və Fərhada münasibəti tərəddüdsüz olaraq yeganə meyarda – xalqa, torpağa məhəbbətlə müəyyənləşir. Nizamidə qəhrəman – Şirin aşiqi Xosrov, Vurğunda qəhrəman – Fərhad aşiqi Şirindir.

Məhəbbətdə də şah olmaq istəyən Xosrov məğlub, eşqinə qul olmağa hazır Fərhad qalib gəlir.

Eşq və hakimiyyət problemi, hakimiyyət əlində əsil sənət problemi (Şapur), mənəvi yoxsa fiziki güc qarşıdurması mövzusu – bunlar müxtəlif fəlsəfə idi. Dövr üçün dağ yaran Fərhadla qala tikən Fərhad arasında fərq də mənalı idi.

* * *

Ömrünün son illərində şairi əbədi insani problemlər, həyatın və taleyin fəlsəfi və tragik məqamları düşündürür. O, ömrün amansızcasına tez ötüb keçdiyini hiss edir, lakin həyat eşqini, fəlsəfi nikbinliyini yenə də itirmir. Əksinə, əsl bir dirilik aşiqi və Faust təmkini ilə bir daha və ucadan bildirir ki, "heç yerə, heç yana mən tələsmirəm".

Görkəmli ədiblərdən biri deyir ki, ölüm sənətkar həyatına əlyazmasının son səhifəsi kimi daxil olmalıdır. "Gödəkçə", "Şair, nə tez qocaldın sən?", "Yada sal məni", "Mən tələsmirəm" hələ təzə başlanan yeni bir əlyazmasının sonu yox, ilk səhifələri idi. Yeni sosial, mənəvi əxlaqi mühitlə birlikdə yenidən doğulan Səməd Vurğunun ilk proqram şeirləri idi. Səməd Vurğunun yenidən doğumu ilə ölümü eyni vaxta düşmüşdü – bəlkə də bu, Azərbaycanda milli poeziyanın tarixində böyük təbii ədalətsizlik və faciə ifadə edən ən dramatik məqamlardan biridir.

Lakin bütövlükdə Səməd Vurğun fenomeni poeziyanın ölümə qalib gəldiyinə, əbədi yaşadığına nümunə kimi daha mənalı və nikbin bir həqiqətin ifadəsidir.

  

* * *

Bu gün müasir, azad, suveren Azərbaycanda milli idealın, ideoloji və mənəvi həyatın bütün sahələrində qlobal siyasətin baş xəttinə çevrildiyi bir dövrdə Vurğunun poeziyası öz tarixi vətəndaşlıq missiyasını bir daha, yenidən təkrar edə bilir. Məhz əxlaq və mənəviyyat saxtalığına, mənəvi ətalətə qarşı bədii mübarizədə həmişə cəngavər və sərkərdə şairin mübariz poeziyası, onun xalqa və Vətənə, ictimai ədalət və humanizm ideallarına romantik və fədakar bir sədaqətlə xidmət edən siqlətli, monumental qəhrəmanları bu gün də müasir ideoloji döyüşlərdə bizimlə bir sırada addımlaya və vuruşa bilirlər.

Səməd Vurğun Vətən və poeziya sözlərini həmişə bir yerdə, sinonim kimi işlətmiş, bir sənətkar və ictimai xadim kimi bu təlimin cəngavər carçısı, əsgəri və sərkərdəsi olmuşdur. Odur ki, bu gün "Vurğun" sözünün özünü də "Vətən" və "poeziya" sözlərinə qaynayıb-qarışmış şəkildə görürük. Onları da bir-birindən ayırmaq qeyri-mümkündür. Nə üçün? Çünki, yenə də şairin öz sualı ilə cavab vermək olar: "Ayrılarmı könül candan!"

**Yaşar Qarayev**

Bakı, 2002-ci il

## CAVANLARA XİTAB

Mənim düşkün könlüm sizdən eləyir
Bu fərz[*] olan təmənnanı, cavanlar.
Unutmayın bəşər sizdən diləyir,
Elm, ədəb, həm irfanı,cavanlar.

Bəşər gülşəninin bülbülüsünüz,
Şanlı firqəmizin sağ əlisiniz,
Zalım əllilərin cəlladısınız,
Dəvasızların dərmanı, cavanlar.

Çarəsiz dərdlərə çarə etməyə,
Quşu vurub həm imdadə yetməyə,
Həyatı ağ, nə ki qarə etməyə
Sərf ediniz hər zamanı, cavanlar.

Yaşayarsa bəşər, yaşar sizinlə,
Soğulmuş[**] çeşmələr axar sizinlə,
Zalımlar geridən baxar, sizinlə
İnqilabın qəhrəmanı, cavanlar.

Çünki tələb edir zavallı bəşər,
Gərək keçə sizdən ona bir əsər.
Yoxsa qan ağlayar yenə sərbəsər,
Olmaz da dərdinə çarə, cavanlar.

İstəsəniz, ölkəmiz, abad olar,
Ellərin məhbusları azad olar,
Onda da Vurğunun könlü şad olar,
Verər sizə can qurbanı, cavanlar.

*1924*

[*] Vacib, zəruri
[**] Qurumuş, tutulmuş

# MAYDAN

...Haman sənə məhəl-məmuriyyətim[*] olan Köçəsgər kəndindən 180 rübləyə bir maydan at almışam. Bu qiymətə həqiqətən layiq idi öz rahat yerişi ilə. Pis və mənfi xasiyyətlərindən birisi də bu idi: daima qaçıb kəndin bağ-bostan və pambığını tələf edirdi. Kəndçilər də deyirdi:

– A müəllim, atını qoyma! A müəllim, atını qoyma!

Doğrusu şu[**] hərif bana[***] çox xəcalət verirdi. Əlavə, hər cün, kənd sözü, obaşdan durub cənabənin hörüyünü dəyişmək məni yuxusuz qoyduğundan ağzım Allahda idi ki, bu zalım itib, ya da tələf olsun. Bir səhər tezdən, adətim üzrə, bunun hörüyünü dəyişməyə qalxdım. Qalxdım nə gördüm? Maydan yoxdur. Üstünə yüngüllük, elə bil ki, zindandan qurtuldum. Görək bu hicrana şair nə dedi:

Səhərdən axşama gəzdim hər yanı,
Bilməm nerdə başı bəlalı maydan?
Dolaşdım piyada bütün obanı,
Səni də görmədim vəfalı, maydan!..

Gözümdən ki getdin bir axşam çağı,
Taladın bütüncə bostanı, bağı.
Çəkdin ciyərimə alosman dağı,
Olasan gözündən yaralı, maydan.

Söylə, gəzdin hansı dağı, dərəni?
Bəni düzdə qoyub aşdın bərəni[****].
Vurdun yerə on səkkizcə tüməni,
Qorxdu gözüm səni alalı, maydan.

---

[*] Xidmət yerim
[**] Bu
[***] Mənə
[****] Keçid, aşırım

Söyləmərəm ki, dağılsın bu kəndi,
Layiqdir bu dağılmağa hərçəndi.
Mənim atım nazənin, gülbədəndi,
Heyrətə salmışdı mahalı maydan.

Örəsiydim* sana bir yaxşı tovla
Ki, içinə yalnız sən qoyula.
Nə bilim ki, axır olacaqmış böylə,
Eylədi Vurğunu cəfalı maydan.

*1925*

---
* Tikəsiydim

## GÖYGÖL

*Əhməd Cavada*

Qucağında bir vaxt bəslədi sizi,
Görmədi sizləri vəfalı Göygöl.
Nişan vermə ona ayı, ulduzu,
Artıq unutmuş o xəyalı Göygöl.

* * *

Əsrlərdən bəri ömrü xar idi.
Zülm əlindən həyatdan bizar idi.
Özü bir yoxluqkən, adı var idi,
Görməmiş ömründə bu halı Göygöl.

* * *

Bu tutduğu işdən olmaz peşiman,
Sən də əbəs yerə olma pərişan,
Müftəxorlar artıq bulamaz imkan,
Yaratdı zəhmətkeş əhali Göygöl.

* * *

Neçə illər bundan qabaqkı çağı,
O solğun bağçanı, o viran bağı,
Xatırlamazmısan, ey "böyük dahi"?
Yaşarmı sizinlə səfalı Göygöl.

* * *

Milli təəssübü atıb araya,
Qanlı Göygöl yaratdın füqəraya,
Çürümüş bir qatıq bir daha maya
Dutamaz qılıyor izhar Göygöl.

* * *

Onun ehtiyacı yox həsbi-hala,
Nifrəti var əski ulduz, hilala.
Sənin kimi bir əfsanə xəyala,
Uyğunlaşsa, yaşar cəfalı Göygöl.

* * *

Cözəlliyi bəlli, məşhuri-cahan,
Qismət olmaz bir də sizlərə inan.
Sizlərə çəkilən o dağa dərman,
Verməyəcək, gəzsən mahalı Göygöl.

*1926, yanvar*

## ŞİKƏSTƏYƏ MƏKTUB

Başına döndüyüm, əziz Şikəstə,
Dinlə məni, halı yaman olmuşam.
Qəlbdən yaralı, könüldən xəstə,
Nanı[*] zəhər, ruzu[**] fəğan olmuşam.

Çatandan bəridir on beş yaşıma
Çox bəlalar gəlib qanlı başıma,
Baltalar vurulub ömür daşıma,
Bu eşqin yolunda yaman olmuşam.

Kəsilib qanadım, uça bilmirəm,
Eşq məhbusuyam qaça bilmirəm.
Heç kəsə dərdimi aça bilmirəm,
Böylə halı çox pərişan olmuşam.

Gərçi istər çəkim cövrü cəfa yar,
Mən dilərəm sürsün çoxlu səfa yar,
Qəsd eyləyir mənə o bivəfa yar,
Qəsdinin altında talan olmuşam.

O mələk simalım, şahbaz baxışlım,
O dodağı ballım, ceyran yerişlim,
Həm o siyah[***] tellim, turac gülüşlüm
Yandırıbdır məni, yanan olmuşam.

[*1926*][****]

---

[*] Çörəyi
[**] Günü
[***] Qara
[****] Bu və sonrakı kvadrat mötərizələr şeirlərin yazılma tarixinin dəqiq olmadığını göstərir.

# SIZILTILARIM

*Möhtərəm və əziz Hüseyn Cavidə*

Xastayım, yalnızım ürəyimdə qəm,
Nəyə dəyər həyat, olmasa həmdəm?
Sevgisiz, sevdasız həyatı sevməm,
Gəl çıxalım seyrə, günlər ötüşsün!

Sürmədim bir həyat canlı dünyada,
Şövkətli dünyada,qanlı dünyada,
Şu* xəstə könlümdən qopan fəryada
Bülbüllər dillənsin, güllər ötüşsün!

Həsrətlər yorğunu, şikəstə könlüm,
Ah, şu dərdli könlüm, şu xəstə könlüm,
Görmədi mürüvvət bir kəsdə könlüm,
Mən gülmərəm aylar-illər ötüşsün!

Yer üzü fanidir, uzaq gəzəlim,
Vicdan sədasını əldə edəlim,
Bir qaranlıq küncə həp** çəkiləlim,
İllərcə paslanan dillər ötüşsün!

Əskimişdir*** yaram, artıq sağalmaz,
Sevdayi-naləmi bir könül almaz.
Bu xəstə Vurğunun dərdi azalmaz
Qoy sınıq könlümdə tellər ötüşsün!

*1926, 11 iyul*

---

* Bu
** Həmişə
*** Köhnəlmiş, dərinə işləmişdir

## TƏRLANIM

Tərlanım, tərlanım, gözəl tərlanım!
Sənə qurban olsun bu Düşgün canım.
Görünsə gözünə bivəfa xanım,
De ki, Vurğun gədalara dönübdür.

Tərlanım, tərlanım, bir qalx havaya,
Bir yazığın gəlsin mən binəvaya,
Məni əğyara satan o bivəfaya
De ki, Vurğun gədalara dönübdür.

Tərlanım, tərlanım, artıbdı qəmim,
Dəryayi-eşqində qərq oldu gəmim.
Görünsə gözünə xəyal həmdəmim,
De ki, Vurğun gədalara dönübdür.

[*1926*]

* * *

Bir gün məni lap boğurdu hicran,
Hicran deyə bir səyahət etdim...
Yarəb!.. Nə yazıq olarmış insan,
Boynum bükük ol məkanə getdim;
Baxdım, onu görmədim o yerdə,
Sordum deyən olmadı ki, nerdə?[*]...
Ey vah, o xəyal pərisi nolmuş?
Ömrüm qəmü-həsrət ilə dolmuş...
Röyamı, nədir bu gördüyüm, ah?!
Xülyamı, nədir bu aləm, ey vah!?
Artıq günəşin ziyası sönsün,
Artıq bu diyar məzara dönsün!
Əflakı[**] ahım dumanı sarsın,
Varlıq sürüşüb zavala varsın!

[*1926*]

[*] Harada
[**] Fələklər, göylər mənasında

## ŞUŞA

Qoynuna girməyə qalmışdır bir az,
Könül fərəhlənib eylədi pərvaz;
Ölməyib görəydim seyrini hər yaz,
Səndə vardır başqa lətafət, Şuşa!

Dağlarından qopar havalı yellər,
Ah, o sərin yellər, səfalı yellər;
Dağıdıb huşumu divanə eylər,
Vüsalın hər kəsə səadət, Şuşa!

Xırdaca-xırdaca yağışın yağar,
Çən-çisək içindən günəşin doğar,
Bir ağız bir bulaq suyunu soğar*,
Eyləyirsən yenə qiyamət, Şuşa!

Bir əcəb gülşəndir torpağın, daşın
Dumanlı dağlardır həyat yoldaşın,
Bir ağrı gördümü ömründə başın,
Ey fitrən xəlq olmuş təbabət, Şuşa!

*1926*

---
* Sonadək içər

## ZEYNAL

Köhnə bir evciyəz gördüm, içi toz, torpaq,
Sökük divarları var hisli, paslı.
Önündə bir baca, içində çılpaq
O səfalətzadə uyuyur yaslı...

* * *

Elə bir yaslı ki, daima xəndan.
Mavi gözlərinin ufuklar kadar
Varsa incəliyi, yenə də giryan,
Gəliyor nəzərə yenə də ağlar...

* * *

Boş deyildi, onun vardı sənəti,
Tar, kamança, tütək, qaval yapardı.
Tutur kimi saza qəmli xilqəti,
Oxuyar, bağırar, sonra yatardı.

* * *

O könül pək incə, pək də mənalı,
Baxışları vardı həp süzgün-süzgün.
Rəqib imiş ona dadlı xəyalı,
Demişdi dərdini o mənə bir gün.

* * *

Hər qürub zamanı pəncərəsindən,
Baxar üfüqlərə sanki bir xəyal...
Qayalar inlərdi onun səsindən,
Mənimdir kainat diyordu Zeynal.

*1926*

## ÇİÇƏK

Gözəl çiçək, dalğalanır dağ döşü,
Nədir o tərpəniş, dəryamı yoxsa?
Söylədilər səni könlümün əşi*,
Həqiqətmi, o da xülyamı yoxsa?

O seyran** buludlar, o boylu çinar
Həp sənə gülümsər, sənə çırpınar.
Deyirsən titrədir məni ruzigar,
Bu dərdə mübtəla dünyamı yoxsa?

Əmərdim hüsnündən min incə duyğu,
Sardımı çöhrəni xəzan soyuğu?
Əlvida, əlvida, daldığım uyğu***
İnanmam ölümmü, röyamı yoxsa?

*1927*

---

* Həmdəm
** Seyr edən, gəzən
*** Xəyal

## DAN YILDIZI

Öpərkən gecələr dəsti-səbahi*
Duyurdum hərəkət namütənahi**...
Çəməndə bir gözəl xeyli ilahi,
Üzündə zülfünü tarimar gördüm.

Titrəyirdi çəmən, titrəyirdi gül,
Oxurdu nəğmələr sabaha bülbül,
Bükmüşdü boynunu saralmış sünbül,
Qoxladım o yeri, laləzar gördüm.

Uçurdu dağlara quş kimi ceyran,
Boylana-boylana səmada tərlan,
Oxurdu türkülər səmiə*** pünhan,
Birləşin! – dedilər, bir şüar gördüm.

Buludlar dağılıb doğdu bir pəri,
O sevda yerinin doğma dilbəri,
Göz atdım gözünə, himlədim bəri,
Dayandı şir kimi, pürvüqar gördüm.

Əsirdi durmadan birbaşa yellər,
Döyürdü bağrını dağ-daşa sellər...
Gülürdü al geyib, ağlayan ellər,
Bu haqqı danamam, aşikar gördüm.

*1927, yanvar*

---

* Sabahın əlini
** Hüdudsuz, sonsuz
*** Qulağa

## BİR QƏTRƏ YAŞ

Saqiya! Saqiya! Gətir gizlicə,
Görənlər olmasın divanələr var.
Nəşələr əməyim bu qəmli gecə,
Bağrına od basan pərvanələr var.

Həyatın sonuymuş bir solğun çiçək,
Qəmləri öldürən qəm olsa gərək,
Açmadı ağlayan üzləri fələk,
Cahanda göz yaşı, qəmxanələr var.

Saqiya! Dustağam zindan görməmiş
Vüsalın dadı yox, hicran görməmiş,
Bir mömin babayam quran görməmiş,
Onda da şübhələr, əfsanələr var.

Nəsibim oldusa bu ahu-vaylar,
Dün* gecə əl verib bahara yaylar,
Ucaldı göylərə şanlı saraylar,
Düşünməz nerədə** viranələr var.

Saqiya! Saqiya! Yetir özünü,
Cahanı görməyim, bağla gözümü.
Şərqə söyləyirəm bu son sözümü:
Yavrusuz*** üşüyən boş lanələr**** var.

*1927*

---

* Dünən
** Harada
*** Körpəsiz, uşaqsız
**** Yuva, ev

## SƏYAHƏT

Ey vətən! Ey ana! Açıldı yolum,
Ümidim sənəmi, qurbanın olum?
Nədəndir demədin heç mənə – oğlum.
Dolandın nerələr[*], de hankı yerlər?

Laçınlar yuvası, haylar ocağı,
Kəsilmiş anacan, vəhşət[**] ayağı.
Yanırkən o gecə birliyin dağı,
Titrədi Qafqazın qoynunda yellər.

Mən Ağrı dağında dayandım bir az,
Bir qaya zirvəsi oxurdu şahbaz[***]
O şiddətli qışın sonunda bu yaz
Yuyurdu tozları kükrəmiş sellər...

Başdan ayağadək geymiş qırmızı,
Oxurdu türkülər bir gürcü qızı
Parladı gün kimi o dan yıldızı,
Üzündə mərcimək[****], köksündə tellər.

Açılsın o gülün, baharım olsun,
Lalə tək qızaran bir yarım olsun.
Sonunda ömrümün məzarım olsun
Gəlinli çeşmələr, sünbüllü çöllər.

*1927*

---

[*] Haralar
[**] Vəhşilik, qorxu
[***] Quş adı, burada "quş kimi" mənasında
[****] Bitki adı, burada "xal" mənasında

* * *

Sorma aqil kimsələrdən, sorma heç dünya nədir,
Böylə bir düstur qocalmış ideal olsun gərək!

"Hər kimin vicdanı pakdırsa o bir divanədir", –
Bu kəlamın barəsində qilüqal olsun gərək!

Çünki boşdur nalə qılmaq, çünki boşdur ahu-zar,
Göz yaşından gözlənən məlhəm mahal olsun gərək!

Aqil olmaq istəyənlər bir-birindən küsməsin,
Əhli-haldan dəm vuran kəs əhli-hal olsun gərək!

Hər bəlaya şir tək gərməkdəyəm mən sinəmi,
Vurğunun "Düşkün" adı Rüstəmi-Zal olsun gərək!

*1927*

## DAĞLAR

Yenə nə durursan pəhləvan kimi,
Çirməyib qolunu mərdanə, dağlar!
Könül yenə bəhri-bipayan* kimi
Səslənir çalxana-çalxana, dağlar!

Mən çox istərdim ki, sənin heç zaman
Örtməsin o dilbər hüsnünü duman.
Elin zərərindən mənfəət uman
Boyansın, demişəm, al qana, dağlar!

Zirvəndəki söyüd göylərə çatır,
Kölgəsində yorğun yolçular yatır;
Maralın, ceyranın min işvə satır,
Su göndər bu yerdə yanana, dağlar!

Çox gözəl olursan ellər köçəndə,
Suyundan gəlinlər, qızlar içəndə;
Qıy vurub tərlanın yel tək keçəndə,
Bir vəlvələ düşər hər yana, dağlar!

*1927*

---

* Ucsuz-bucaqsız, sahili görünməyən dəniz kimi

## ANA

Pək çocuqdum yerə gömdülər səni,
Həyata qanadsız atdılar məni.
Bax, necə pozulub ömrüm gülşəni,
Həyat sənsiz mənə zindandır, ana!

Qoynunda bəslənir gözəl diləklər,
Layiqdir səcdəyə sənə mələklər,
Nerdəsən, ah gözlərim həp səni bəklər,
Bax övladın nasıl giryandır, ana!

Sən bir günəş idin, doğdun da batdın,
Yazıq övladını qəmlərə atdın.
Bir cavab ver, hankı murada çatdın
Torpaqlarda neçə zamandır, ana!

Bir ah çəksəm sənsiz, qopmazmı tufan?
Əzizim anacan, gözüm anacan!
Yumuq gözlərini aç da bir oyan,
Şimdi zaman başqa zamandır, ana!

Yıxılıb payinə* öpməki stərəm,
Analıq mehrini görmək istərəm,
Səni görmək üçün ölmək istərəm,
Təsəllim ah ilə fəğandır, ana!

[*1927*]

---
* Ayağına

## BİZİM DAĞLARIN

Dün oxdum şerini, düşdü yadıma
Gülümsər dövranı bizim dağların.
Oxudum ki, yoxdur sizin yaylada
Gülü, gülüstanı bizim dağların.

Bilməm kaç əsrdir yaranmış durar,
Cansız cəsədlərə dirilik urar
Səhər irişincə* bin** nəğmə qurar
Şahbazı, tərlanı bizim dağların.

Əlvan çiçəkləri saralmaz, solmaz,
Baxdıqca onlara könüllər doymaz,
Çeşmələr başından heç əskik olmaz
Zurna-balabanı bizim dağların.

Ətrafı taladır, ceyran yuvası,
Ruhları məst edər sərin havası,
Sizin yerdə olmaz, onun səfası,
Cənnətdir hər yanı bizim dağların.

Yasəmənlər, gül reyhanlar ocağı,
Bizim dağlar bir təbabət qucağı,
Dişləri göynədən soyuq bulağı,
Genişdir meydanı bizim dağların.

Bir-birindən gözəl vardır meşəsi,
Səs versən, səs salar hər yana səsi.
Qazanar hər kəsdən sevinc həvəsi
Çölü, biyabanı bizim dağların.

Şeh düşər otların üstə gecədən,
Doymaq olmaz orda xoruz-beçədən,
Dəyəsi*** qurular qalın keçədən
Dərdlərin dərmanı bizim dağların.

---

* Səhərin gözləri açılan kimi
** Min
*** Alaçıq





Qoyun, quzu bir-birinə qarışar,
Qulplu qazanlardan qatıqlar daşar.
Böylə həyat içrə yüzdən çox yaşar
Zəhmətkeş dehqanı bizim dağların.

Bəslədiyi kök quzulardan kəsər,
Bolluq içrə ömür sürər sərbəsər.
Boynun əyib çeşmələrdən su içər
Maralı, ceyranı bizim dağların.

Xırdaca-xırdaca yağar yağışlar,
Xəstə Vurğun bu dövranı alqışlar.
Möhtərəm qarelər[*] məni bağışlar,
Cavandır yazanı bizim dağların.

[*1927*]

---

[*] Oxucular

## MÜƏLLİMLİK

Müəllimlik – bu bir incə sənətdir,
Bu yolu hər gedən olmalı incə.
Saralmaz bir çəmən o göyərincə,
Həyata pək yaxın bir məhəbbətdir.

Almanlar etmişdir çox kərə təkrar –
Mənimdir gələcək... müəllimim var...
Dinlə vətəndaşım! Belə bir şüar
Hər qəlbə tac verən bir fəzilətdir.

Qələlər, zindanlar, qorxunc diləklər,
Atəşli vicdanlar, çılğın ürəklər,
Üfüqündə məbud bir boşluq bəklər,
Baxdım keçmişlərə, bu həqiqətdir...

Ey göylər suları, sən boşalma, dol!
Tutduğun çiçəkli, reyhanlı bu yol
Hər qəlbə sevinclər vəd edər bol-bol...
Bu günün qayəsi çünki zəhmətdir.

*1927, iyun*

---

[*] *Məbud* sözü burada sonsuzluq mənasında işlənmişdir.

## ŞƏKİ

Dünki[*] bir lövhə ki, hər səmti viran,
Dünki bir sinə ki, başdan-başa qan.
Dünki hicranla, səfalətlə gülən,
O gülüşlərlə belindən bükülən
Yeni bir səhnədə cövlan edirəm,
Sisli, yağmurlu sokaklar[**] gedirəm.
Qəlbi yox, duyğusu yox, şir kimi nər
Bu yerin dağları hər gün bəzənər.
Bəzənər, sanki xəyalımla tanış,
Nə qədər fitri, gözəl bir yaranış
Ki, dəyişməm onu heç bir gözələ.
Bir zaman bəlkə də əllərdən ələ
Düşərək ömür eləmiş zillətlə.
Əski, pək əski röya, bidətlə[***]...
Hələ çaylardakı coşqun cərəyan,
Bana bir başqa xəyalatı bəyan
Ediyor. Böylə deyirlər ki, bu gün
Ucalır göylərə bir şanlı dügün.
Bən də təbrik edirəm iş bu halı,
Artacaq yurdumun əlbət cəlalı.

*1927, iyul*

---

[*] Dünənki, keçmiş mənasında
[**] Küçələr – çətin, əzablı yollar mənasında
[***] Etiqad, inam mənasında

## ONDAN DA GÖZƏLDİR

Göylər ki, müləvvən[*] o şəfəqlərlə bərabər,
Dəryalara, səhralara min cilvə[**] sərasər –
Ərz etmədə, bilməm nə zamandan bəri aləm
Göylər deyə, göylər deyə çalxandı dəmadəm[***].
Çalxandı nəhayətsiz olan boşluğa əfkar[****],
Ən sonra təbiətdəki hikmətlərə naçar,
Məruz olaraq enməyə bir cəbr ilə döndü,
Min dürlü ziya parladı, min ah ilə söndü.
Sönmək! O qaranlıq ki, çıxılmaz yolu var, ah!..
Ömrün sonu ad verdi bu mənalara Allah!
Allah! O nədir? Məncə təxəyyül cərəyani,
Görmək diləröm, varsa görünsün o "əyani".
Atəş, su, bulud bir zaman Allah idi əlbət,
Heyhat! Onu məhv etdi xəyalən bəşəriyyət.
Dönmüş, o da dönmüş və dəyişmiş, bunu bildim,
İmdiysə onun eşqini çirkab ilə sildim,
Sildim və inanmam ki, bunun hökmü əzəldir,
Torpaqlara can verməyim ondan da gözəldir.

*1927, iyul*

---

[*] Rəngarəng, əlvan bəzənmiş, boyanmış mənasında
[**] Gözəllik vermək, əlvanlaşdırmaq
[***] Daima, həmişə
[****] Fikirlər

## ORDA...

Uzaq, bu həyatdan uzaq bir yer var
Yaşıl dağlarında sərin bir ruzgar.
Orda nə qəm vardır, nə bəla vardır,
Desəm inanmazlar, etila* vardır
Ki, bütün varlığım, həp duyğularım,
Müxtəlif dərdlərim və qayğılarım
Orda, o ilahi çöhrədə gülər,
Qarşımda saraylar, taclar bükülər.
Həm də bidətlərdən**, dürlü imandan
Bir əsər görünməz, çünki hər yandan
Hər qəlbə müsavi*** məşəllər doğar,
Bütün məsləkləri bir məslək boğar:
Bu isə yaşamaq, həm yaşatmaqdır,
Yarınkı dünyaya bu gün çatmaqdır.

*1927, iyul*

---

* Ucalıq, yüksəklik
** Etiqad, inam
*** Bərabər

## SALYAN GÖZƏLİ

Mənə hər gün bu yaxın pəncərədən
Dəli bir gözlə baxırsan, bu nədən?
Yoxsa qəlbimdəki gizlin əməli
Bəlkə bilmişsən, a Salyan gözəli!
İndi bil söyləyirəm mən də açıq,
Səni görmək diləröm, yollara çıx!
Çıx ki, arxanca mən eyvah eləyim,
Sonra əhvalımı izhar eləyim,
Sən qərib, mən də qərib... yox yananım,
dərd qananım...
Yenə ruhum dəli, yurdsuz kələbək*
Kimi izlər sarı torpaqda çiçək.
Mənə dünyada bu cür ən göyçək,
Ən gözəl qüvvə ki, parlar bədənin,
Belə derlər ki, xəyalında sənin
Bir çocuq var... onu at! Ey gözəlim!
Sənə layiq deyil, əlbət, o çocuq.

[*1927*]

---
* Kəpənək

## BƏLKƏ

Deyirlər Şəkinin bu yaxın dağı
Bəsləmiş bir maral-hər qəlbə yağı.
Üçüncü gündür ki, aldım sorağı,
Bulacaqdərdimə bir çarə bəlkə...

Əyilsin səcdənə ulduzlar, aylar,
Əskimiş* məbədlər, yeni saraylar.
Bir qərib könül var, səni haraylar,
Əlindən sağala bu yarə bəlkə.

Nə deyim! Böylədir əzəldən işim,
Gözəllik yoludur mənim gedişim.
Ağarsa saçlarım, tökülsə dişim,
İstərəm yetişəm o yarə, bəlkə...

*1927*

* Köhnəlmiş

## ONA...

Bunu idrak edib də bir öyrən,
Sənə məhkum mən olmadım fikrən.
Nə rəvadır vüsala aldanmaq,
O titrəyən səsinə həp yanmaq.
İstəmişssə də qəlbi-məcruhim*,
Dəyişdim indi başqa bir ruhim.
Azacıq varsa da vicdan əliniz.
Məni bir qul kimisə dinləyiniz.
Nə zamandan bəri, yavrum, solaraq,
O sönən eşq ilə sərməst olaraq,
Endim eyvah ki, endikcə dizə,
Yenə hicran, yenə dərd qaldı bizə...
İştə, bundan məni sarsıtdı həyat,
İstəyər... istəyə varmaz bu qanad.
Lakin ümmid, o böyük dəsti-kərəm**
Oxuyur qəlbimə bir başqa sənəm:
Ki, şəbabin*** üzü bir gün güləcək,
Ağlayan gözləri oxşar, siləcək,
Yeni bir səhneyi-ülfət**** doğacaq,
Qaralar zəhrimi birdən soğacaq.
O zaman Fikrəti təqib edərək
Bu yaxın dağları dümdüz gedərək,
Oxuyub keçmişə lənət, yaşaram,
Toxunub göylərə bir gün coşaram
Məni məhv etsə də fikrim, ələmim
Yazacaq "Hamleti" coşqun qələmim

[*1927*]

___________

* Qırıq, yaralanmış qəlbim
** Kərəm əli – ümid, çıxış yolu mənasında
*** Gəncliyin
**** Dostluq münasibətləri

## NƏ VAXT GÜLƏCƏYƏM?

Nə qədər məyus, ah, nə qədər ölgün,
Nə qədər cansızam yenə mən bu gün.
Dəyişmiş gördüyün köhnə şiri-nər,
Əsər xəyalıma nəsimi-kədər*.
Hələ gör nə halda, gör nə dəmdəyəm?
Bütün varlığımla yəs, ələmdəyəm.
Vücudum torpaqda, sürünür daşda,
Xəyalımsa durur hamıdan başda;
Rəqs edər o mavi, ağ buludlarda,
Enər, nəfəs alar yaşıl otlarda.
Gəzər-gəzər öylə durmadan bir an,
Arar-arar, yavrum, bir geniş meydan;
Öylə bir meydan ki, gülsün azadə,
Çəkdiyim zillətlər düşməsin yadə.
Bəşər dedikləri duyğusuz vicdan,
O boyalı sima, o dönük iman
Bir az da çırpınsın, gülsün, əylənsin
Ucalmaq istərsə, bir qədər ensin;
Ensin, qaranlıqdan kamiyab** olsun,
Qürurun gülşəni saralsın, solsun!
Dəmir qollarıyla fəxr edən kütlə,
Bağırsın, hayqırsın, həm də cürətlə,
Qursun bir ailə... bircə ailə...
Müjdələr gəlsin bu şeyda bülbülə,
O zaman gülərəm, gülərəm, heyhat...
Bilməm gələcəkmi bir böylə həyat?..

[*1927*]

---

* Kədər yeli

** Arzusuna çatan

## DAĞLARA XİTAB

Dağlar! Sizdəki şu böyüklük, vüqar
Nə olur bir zaman olsaydı bəndə.
Bəlkə sayılardım o gün bəxtiyar,
Vicdanımı yaxan bu zəhri-xəndə*.
Bəlkə çəkilərdi bir duman kimi.
O zaman bu xəstə qəlbim əsəbi
Və coşqun sulara məxsus ahənglə,
Lazım gəlsə məşğul olardım cənglə...
Əvət! Tapdalardım, döyər, əzərdim
İnsanlığın** məğrur, dönməz başını...
Ən sonra qayğısız, bihuş gəzərdim,
Nə dərdi sevərdim, nə göz yaşını.

[*1927*]

---

* Zəhərli, acı gülüş
** Nadanlıq nəzərdə tutulur

## ELLƏR GÖZƏLİ

Nal tökən dağları yel kimi keçər,
Hər zümrüd yamacdan bir çiçək seçər,
Qaynar bulaqların gözündən içər
O ellər gözəli, o el yavrusu.

Teylənər* dağların qılınc yalında,
Bəzən açıqlıqda, bəzən qalında,
Elə bil ay durur bulud dalında,
O ellər gözəli, o el yavrusu.

[*1927*]

## ONU GÖRÜRKƏN...

Alovlan, ey könül, yenə alovlan!
Bu gün lap dəyişib o günkü canan.
Dilbərim yorulub səyahətindən,
Düşübdür o keçən təravətindən.
Bir zaman o pəri yalnız yaşardı,
Quş kimi sıldırım dağlar aşardı.
İndi bükülmüşdür böylə tez beli,
Sığal verilməyən o qumral teli
Tarimar görürəm... Bu bəsdir mana,
Ey məni tərk edən, qal yana-yana!

*1927*

---
* Qaçar

## ŞİKAYƏT

Mənəm bu dünyada bəlalar çəkən
Nakişi, naşükür insan əlindən.
O hankı vicdan ki, ağlar, ay aman!
Gündə bir don geyən dövran əlindən?!.

Qalmamış qüdrətim... dalğınam çoxdan,
Unutdum varlığı... dönmədim yoxdan...
Fələklər tac saldı mən atan oxdan,
Çıxmadım bu qanlı meydan əlindən.

Sürün, sürün, iştə durmadan bir an,
Sən ey vəhşətindən feyz alan insan!
Yarın* gülmək üçün, ağlasın cahan
Bu Tövrat, bu İncil, Quran əlindən.

[*1927*]

* Sabah, gələcəkdə mənasında

* * *

İllər, qərinələr keçirsə aləm,
Yadımda saxlaram hər zaman səni.
Dərdimi bilməyən varmı bir adəm?
Bu bir həqiqət ki, sevdi can səni.

Dün öylə gedirdin ahəstə, rəvan,
Bulandı su kimi gözlərimdə qan,
Bir mənim başıma gəlmədi hicran,
Kim basdı bağrına canhacan səni?..

O axşam, röyada gəzişə çıxdım,
Aramızı vuran bir evi yıxdım...
Titrəyə-titrəyə əlini sıxdım,
Baxdım, zəhərləmiş o ilan səni...

Baxırdın, sevdiyim, sən məlul-məlul,
Çırpınar, gülərkən sevdalı ilul[*].
Bağırdım gülərək... ey ləkəli dul!..
Məndən başqa sevməz bir insan səni!

[*1927*]

---

[*] İyul

## SƏNƏT

Düyünlü dağları kökündən vuran
Əmək cəbhəsində "amansız"* duran,
Əqrəbli çöllərdə bağ-bostan quran,
Zəhməti güldürən sənət olacaq.

Azəri yurdunun zəhmətkeş oğlu,
Ürəyi sevinclə, ümidlə dolu,
Çəlikdən** duruşu, dəmirdən qolu,
Zəhməti güldürən sənət olacaq.

Ey göylər suları, sən boşalma, dol!
Tutduğun çiçəkli, reyhanlı bu yol,
Hər qəlbə sevinclər vəd edər bol-bol,
Zəhməti güldürən sənət olacaq!

[*1927*]

---

* Möhkəm dayanmaq mənasında
** Polad kimi möhkəm

# DİLCAN DƏRƏSİ

Yenə gördüm səni, Dilcan dərəsi,
Yadıma çox köhnə zamanlar gəlir.
Ömür dedikləri bir karvan yolu,
Nə canlar gedərək, nə canlar gəlir.

Fələklər yaratmış bu yeri cənnət –
Desəm, çox münasib həqqindir əlbət.
Səndə var doğruluq, var səmimiyyət,
O ibrət bağına loğmanlar gəlir.

Yazda gülümsərkən bütün kainat,
Sən də bəzənərsən açarsan qanad;
.................................
Hər axşam səcdənə dumanlar gəlir.

Qaşlar yarılanda günün telindən,
Əmərsən dağların qarlı selindən.
Sənə qonşu olan Qazax elindən
Vəfalı, vəfasız mehmanlar gəlir.

Yüksələr tar səsi hər eyvanından,
Quşlar qanad salar keçsə yanından.
Daşlar boyanmışdı bir gün qanından,
Xəyalıma qara dövranlar gəlir...

*1927*

## HAZIR OLUNUZ!

Önümdə tufan var, hazır olunuz,
İgid Qafqazımın köhlən atları!
Poladdan möhkəmdir sizin qolunuz,
Quraq tərkinizdə pulemyotları!

Çılğın dühalar ki, hökm edər Qərbə,
Səbəb olacaqdır bir geniş hərbə
Əminəm, vurduğum bu sonku zərbə
Əyəcək yüksələn o qanadları!..

Əyəcək bilirəm, məndədir qüvvət,
Birlikdə can bulur hər qərib niyyət.
Ey cəbini* Qərbin, sizdəsə əlbət
Hikmətin ən qorxunc aparatları.

Məndə də möhtəşəm, əlçatmaz vüqar,
Yediyi buz həmən, içdiyi də qar,
Sağlam bir ölkənin möhkəm fikri var.
Yarılsın nərəmdən dağın qatları!..

*1927*

---

* Müti, boyun əyən, qorxaq mənasında

## UNUT...

Unut, dedim, unut! Gətirmə yada,
Bir daha dünyada sən, ey səs, məni!
Sevdanın uğursuz o yollarında
Daş-qalaq eylədi hər bir kəs məni.

Çəmənlər, bağçalar, bağlar sararsa,
Fəzalar dönərək sular qararsa
Hər şeyi bir ölüm qorxusu sarsa,
Əyilməm bir daha... bir həvəs məni
Hər dürlü matəmdən, qəmdən uçurdu
Xəstə xatirimdə bir həyat qurdu.
Tərk etdim o Qazax adlanan yurdu,
Orda zəhərlədi bir nəfəs məni.

Qoy gülsün taleyim, gülsün həyatım,
Silinsin əskimiş hər xatiratım.
Baxdım ki, bu yeni-yeni ayatım*
Deyir sıxmayacaq bir qəfəs məni.

*1927*

## ÇƏKİL...

Çəkil, çəkil artıq yoruldum, bıqdım**,
Yanarsan, çox yaxın durma, ahımdan.
Bir gün mən başqa bir dünyaya çıxdım
O əski, pək əski qərargahımdan.
Bax, bu seyr etdiyim işçinin yurdu
O bədbin qəlbimə çox ağır vurdu.
Şikayətçi idim bəlkə xilqətdən,
Bu gün qüvvət aldım mən təbiətdən,
Bəlalar tanrısı o məhəbbətdən,
Çəkindim və döndüm qibləgahımdan...

*1927*

* Yeni yazdıqlarını, fikirlərini, düşüncələrini nəzərdə tutur.
** Yoruldum, bezdim

# ƏYİLMƏ!

Həyat! O çox zaman görünür iyrənc,
Bu səhnədə min bir qanlı pərdə var
Sən bu çətinliyə düşsən də, ey gənc,
İçində saxlanan qüdrətə yalvar!

Zaman! O amansız, qatil bir düşkün
Bəzən dünyaları döyər şiddətlə.
Səni də məhv etmək istərsə bir gün,
Hər şeyə qarşı çıx, həm də cürətlə.

Cürət! Odur bizi güldürən hər an,
Cürətsiz bir həyat məhv olur, inan.
İştə bu düsturu öyrənib də sən,
Ər oğlu ər kimi tab et bəlayə.

Mən bu sözlərimlə nə dedim bil sən,
Çırpın üfüqlərə, uç etilayə!
Ey gənc! Səadəti bir xəyal bilmə,
Nə olursa-olsun, yalnız əyilmə!

[*1927*]

## ADSIZ ŞEİR

Mən o sevdalı qızın,
O qanadlı yıldızın
Hər halını sevərkən,
Bu bəlaya pək erkən
Düşməyimi bilmədim.
O zamandan gülmədim.
İtginəm, aranmadım.
Mən buna yaranmadım.
Unut sən də gözəl qız!
Mənə dünyada yalnız,
Yalnız qaldı kölgələr,
Qarlı, buzlu ölkələr...
Hey gedirəm durmadan,
Bir yuvacıq qurmadan,
Səbəb nədir bu işə?
Bu sərsəri gedişə...

*1927, sentyabr*

## QADIN

Qadın! O sevimli, süslü bir sona,
Mən əsirəm, əlbət, əsirəm ona.
O bəzən bir mələk, bəzən iblisdir,
Çünki başdan-başa zövqdür, hissdir;
Onda sevinclər var, iztirablar var.
Bütün mənasilə etila, vüqar
Həp ondan, qadından, o gözəldəndir,
Bu bir yeni deyil, bu əzəldəndir.

*1927, 15 noyabr*

* * *

Bir qəlb ki, çalxalanar, hər zaman coşar,
Tufanlar keçirən dəryaya bənzər.
Qafqazda çırpınar, Altaya qoşar,
Dağlardan atılan bir yaya bənzər.

Of... bu yerlər yazıq ruhuma dardır,
Kəsilmiş yollarım dumandır qardır.
Vaxta ki, bu hüdud, bu sərhəd vardır,
Ömür dedikləri röyaya bənzər.

Sən ey mərhəmətsiz, duyğusuz, casus!
Ey sərvət dünyası, sən sürün, sən sus!
Bəşər qardaşlığı tərk etmiş, əfsus!
Hər əməl dumanlı xülyaya bənzər.

*1927, 2 dekabr*

## ANDIM

Mən and içmişəm ki, bir də qələmim
Gözəllərdən ilham almayacaqdır.
Peymanını pozan xəyal həmdəmim
Dərgahıma sayə salmayacaqdır.

Keçindim nə yaman dərdi-hal ilə,
Bir qara üzlü, ah, ideal ilə...
Açılmaz ürəyim hər vüsal ilə;
Onlardan yadigar qalmayacaqdır.

Hesablaşmaq istər könül xilqətlə,
Bir sevdiyim deyil, hər təbiətlə;
Gülsəm, güləcəyəm, əbədiyyətlə,
Sazım gəldi-gedər çalmayacaqdır.

*1928, 7 yanvar*

## BAYRAM QABAĞI

*Mayıs[*] üçün*

Gənclər! Bu gün sizi ülvi, ziqiymət[**],
Bir gün qarşısında görürəm əlbət.
Həyata can verən bu qızıl sancaq[***],
Hörmətə şayestə[****], layiqdir ancaq.

Ey gənc! Unutma ki, hər səadəti,
Uğursuz bir qüvvə güdər, eşit ha!
İştə həyatın bu sərsəm adəti,
Tarixə kölgələr əks edər hala?!

Əvət zəman-zəman bu düsturi bən,
Düşündükcə bəza[*****] qalıram məyus.
Vəqta bu acizlik çox da sürmədən,
Önümdə səslənir bu günə məxsus.
Əvət o... o böyük, o cəsur heykəl,
Diyor mətanəti gəl bəndən öyrən.

Oxuyun, öyrənin o dühayi siz,
Odur quranımız, odur ayəmiz.
Gənclər! Alovlardan xəlq olunduq biz,
Yaşamaq, yaşamaq, budur qayəmiz.

*1928*

---

[*] May
[**] Qiymətli, əlamətdar
[***] Bayraq
[****] Yaraşan, layiq
[*****] Bəzən

## HƏYATA DOĞRU...

Yetər! Yetər artıq boş əyləncələr,
Can almaq vaxtıdır bu gün xilqətdən...
Günəşli gündüzlər, aylı gecələr,
Bir ağızla deyir: yaz təbiətdən!

Yetər telli sazlar, şikəstə "ney"lər,
Bu nalələr bizi dağıdar, eylər.
Yetər, zənn edirəm xəyali şeylər,
Bir az da bəhs edək biz maddiyyatdan.

Uyduq əzəl gündən hər xəyala biz,
Buludlarda söndü hissiyyatımız...
Boğuldu dərdlərlə kainatımız,
Qayə bunlarmıdır incəsənətdən?

Yetər vaxt itirmək təranələrlə,
Yetər oda yanmaq pərvanələrlə,
Həyat geri qaldı əfsanələrlə,
Uzaqlaşmalıyıq hər təriqətdən.

Gəlin! Gəlin bu gün fürsət əldəykən,
Qanlı dəryalara göndərək yelkən...
Sən, ey dünyasından əlini çəkən!
Nə tapdın o sonsuz göyə xidmətdən?

Zavallı! Bir dön də ətrafına bax!
Bir bax ki, gecələr nə qədər parlaq!
Qaranlıq qəlbində sən dəxi od yax,
Günəşli gündüzlər doğar zülmətdən.

*1928*

## QAFQAZ

Bilsin axtaranım, tanışım, dostum,
Eşitsin dənizlər, qaralar* məni
Adım çəkiləli qan, irin qusdum.
Çox incitdi mübhəm yaralar məni.

Gələli dünyaya Məhəmməd, İsa,
Qırdı qardaşlığın şah damarını
Onların qoyduğu məscid, kəlisa
Hələ də sormada xalqın varını.

Əyildim şahlara, xanlara xeyli
Vuran vurmayana "Sən də vur" dedi.
Ölüm pəncəsində yaşamaq meyli
Cəlladlara qızdı "Bir az dur" dedi.

Əsdi zərbələrlə duyğusuz ruzgar
Dedim "Qara günün, ağ günü" də var.
Artıq aradığım o gün doğalı,
Dillərdə nəğmə var, sularda halə,

Qoynumda dost əli mehman olalı
Zümrüd yamaclarım bitirdi lalə.
Haqqın, ədalətin dönməyən qolu
Açdı hər qapıya bağlanan yolu

[*1928*]

---
* Quru, torpaq, insanlar mənasında

## ŞERİM

*Hörmətli əmizadəm İbrahimə*

Sən nəsən? Hər zaman, hər an çalxanan,
Bu darğın qəlbimin həyəcanısan.
Artıq unudulmuş keçən günlərin
Gözümdə canlanan son nişanısan.

İncəlik hər qəlbi qəhr edər gerçək!
Gəl bu əninindən*, ahından əl çək.
Sən ey yazıq şerim, ey solğun çiçək
Matəm dəryasısan dərd ümmanısan.

*1928, 31 may*

## ACI GÜLÜŞLƏR

Sən ey altun qəfəslərdə xumarlanan, süzülən,
Bilirmisən hüsnünlə hankı qəlbdir üzülən?
O qəlbdir ki, həyatında min bir acı yemişdir,
Əzəl gündən gəncliyini sənə qurban demişdir.
O qəlbdir ki, yetimlikdə, yoxsulluqda boğuldu,
Təbiətin ən qarışıq bir günündə doğuldu...
İştə, məni qəhr edirkən bu sayğısız səfalət,
Vurulduğum o gözlərdə mən axtardım səadət.
Fəqət, sən ey zənginlərin, böyüklərin yavrusu,
Dünyalara hakim olan bir şairin qayğusu
Əsdi qara yellər kimi, gəlib keçdi yanından,
Mən doymaram ovuc-ovuc içsəm belə qanından...
Özün gəl, ey sevdiciyim, özün çıx meydanıma.
Ya qanına mən boyanım, ya sən boyan qanıma...

*1928, 31 may*

---
* Dərd

* * *

Bir yaz sabahının ilk əzanıydı,
Süzüldü gözlərim xumarlanaraq.
Xilqətin mənalı bir zamanıydı,
Sular səslənirdi dalğalanaraq.

Açdım önümdəki bir pəncərəni,
Adamı şiddətlə döydü küləklər.
Mən seyrə dalırkən dağı, dərəni,
Uzaqdan gülürdü güllər, çiçəklər.

Ağarırkən göyün siyah kəfəni,
Bu gün bir coşqunluq vardı qanımda.
Mən əski qəlb ilə anaraq səni,
Demişdim: "Ah, Əkrəm olsan yanımda!"

*1928, 1 sentyabr*

* * *

Çəkdiyim ağrılar bir yana dursun,
İnsafı, mürvəti sən atmadınmı?
Mən sənə yar desəm dilim qurusun,
Yarı, məhəbbəti sən satmadınmı?

Qırdın qanadımı, qırdın qolumu,
İtirdin qəlbini, azdın yolunu.
Tərlan xəyalımı, laçın könlümü
Aldadıb-aldadıb oynatmadınmı?

Vurğunun ahları yüksəlir göyə,
Sormadın bu sirri, sormadın niyə?
Dünyada bir şöhrət, bir altun deyə
Şahmarın qoynunda sən yatmadınmı?

*1928, 20 oktyabr*

# İŞÇİ

Əyilsin səcdənə yıldızlar, aylar,
Sənsən dünyaların fəxri, şöhrəti.
Qarşında diz çökdü “Şanlı saraylar”.
Çünki qollarının vardır qüvvəti!

Mən səni çox zaman gördüm əzilən,
Ummadın kimsədən imdad, mərhəmət,
Sən ey dost bağçası, sən ey dərd bilən!
Sən öz qüdrətinə sığındın əvət!

O günkü keçmişin məşəli söndü,
Bir yeni kainat çıxdı qarşına.
O qara qüvvələr xəyala döndü,
Beş guşəli yıldız taxdın başına.

Uzaqdan çınladı əmək səsləri,
Sən də dayanmadan dedin: – İləri.

*1928*

* * *

Ey uzaq göylərin yaxın elçisi!
Şərqi təmsil edər mənəviyyatın.
Rəngi-ruyimə bax, soldurdu məni
Şübhələrlə dolu bir çox ayatın[*].

Sən dedin ki, ruhum, fikrim azadə,
Üfüqlər yolçusu dəli bir quşdur.
O sağır göylərə açdığın cadə[**]
Zəif qanadlarçün, bil ki, yoxuşdur.

Məncə, istəklərin olsaydı burda,
Qapanardı sənə göylərin yolu;
Açıq bir nəzərlə baxsan hər yurda
Qanlı bir xəncərdir bəşərin qolu...

Böylə bir tarixdə öylə bir dünya
Bilməm ki, şairim, mümkünmü qurmaq?
Məndə də bir zaman vardı o röya,
Uzaq kəhkəşanda qavallar vurmaq.

*1928*

[*] Ayələrin, burada düşündüklərin, dediklərin mənasında.
[**] Geniş, böyük yol

## ÖMRÜN PƏRİŞAN GÜNLƏRİ

Açılıb gülsün, əzizim, hər çəmən, hər laləzar,
Solmasın, yavrum, a Leyla, novbaharın gülləri.

Şerimin qəlbi qədər qoy saf olub gülsün həyat,
Oxşasın hər ruhu, qəlbi gülşənin bülbülləri.

Özgə bir aləm olub hökm eyləsin hər ürəyə,
Ellərin məsum həyatı, çöllərin sünbülləri.

Nə rəvadır bir qızın fikriylə məhv olsun bəşər!
Qıyma boğsun Vurğunu ömrün pərişan günləri.

*1928*

## İNGİLİS

Bilirəm hər qəlbin mən iç üzünü,
Bir çoxu fitnəli, həm böhtanlıdır
Yenə qan içməyə dikib gözünü
O yer ki, krallı və soltanlıdır.

Qərbin üfüqündə bir bulud gəzər,
Əqrəbə, əfiyə, ilana bənzər.
Uzaq Şərq elinə qılsanız nəzər,
Könüllər zədəli və hicranlıdır.

Anlamaz cahanda nə vicdan, nə hiss
O, insan donunda qocaman iblis.
Çox da öyünməsin xain ingilis,
Mənim aslan könlüm dəliqanlıdır.

*1928*

## UZAQLARA DOĞRU

Arkadaş, deyirlər Əfqanda, Çində
İnsanlar boğulur qanlar içində.
Yenə də hökm edir xain istismar,
Ağrıyan başların bəlaları var.
Hər gün yeni bir dərd, yeni bir ələm,
Qartal pəncələrdə qəhr olur aləm.
Qəhr olur insanlıq, qəhr olur insan.
Get-gedə tərk olur, alçalır vicdan;
Həm də, gözdən iraq, gəlinlər qızlar
Əlləri qoynunda zarıyar, sızlar;
Sızlar qoca Şərqin məhkum yavrusı
Çoxunun bir parça əkmək* qayğusu
O qarlı dağlara kim açacaq yol?
Komsomol ... komsomol ... yalnız komsomol...

*1928*

---

* Çörək

## ŞEİR

O axşam gəldim sizə,
Nə hörmət etdin bizə?
Bir durarıq diz-dizə,
Qanında yox hərarət.

Eşqimi qanmadınız,
Heç də inanmadınız;
Neçin utanmadınız?
Heç satılırmı afət?

Bir şairəm yaralı,
Sevdiyimdən aralı;
Siz satdınız maralı,
Mən çəkirəm xəcalət.

Dağlardakı saf suyam,
Eşqimin yolçusuyam.
Demirəm ki, qoçuyam,
Yerində dur fərağat!

*1928*

* * *

Bilməm nə xəyal ilə oyandım yenə erkən;
Bir quş ki, uça düzlərə, səhralara azad
Axşamları öz yurduna həsrətlə dönərkən,
Çırpınmağa başlar yenə ruhumdakı fəryad.

Qafqaz! O xəyal şahpəri röyama gələrkən
Bir səs mənə qalx, qalx, – deyə qəmlərdə gülümsər...
Yalqız quzu madər[*] deyə ağlar və mələrkən
Bir pəncə əzər qəhr ilə vicdanımı yeksər.

Əlbət məni, təqib edəcəklər ki, bu fəryad
Bədbinlərə məxsus, bizi şad etməyəcəkdir.
Eyvah ki, min pəncədən olsam da həp azad
Məndən o vətən zövqü uzaq getməyəcəkdir.

[*1928*]

---

[*] Ana

* * *

Həyat dedikləri şübhəli bir şey,
Ölümsə şübhədən çıxmaq deməkdir.
Bu qəmgin təranə... bu kədərli ney
Varlığı heçlikdə boğub yeməkdir...

Mən də yolçusuydum bir zaman, əlbət,
Bu köhnə dünyanın, fəqət nə gördüm?
Hər gülən dodaqda bir qəmü həsrət,
O qızın saçından mən ilham hördüm.

Əsdi qara yellər, qanadı dizim,
Gəncliyim tükənməz məlala düşdü.
Mən bir karvanam ki, qalmadı izim,
Ömrümün ilk günü zavala düşdü.

[*1928*]

## BAHAR ŞƏRQİSİ

*Körpələrə*

Günəş doğdu, yayıldı,
Yatan ellər ayıldı.
Açdı çiçəkli güllər,
Dilə gəldi bülbüllər.
Qar, çovğun gözdən itdi,
Dağlarda lalə bitdi.
Qanadlandı buludlar;
Yerdəki əlvan otlar
Cücərib boy atdılar,
Aləmə naz satdılar.
Artdı suların səsi,
Sevindirdi hər kəsi.

*1928*

## MATƏM NƏĞMƏSİ

Gedərkən sükuta gecənin qəlbi,
Eşitdim sularda matəm nəğməsi.
Bilmədim nəymiş o qətlin səbəbi,
O hadisə heyran qoyur hər kəsi.

Ey insan! O yazıq, o tökdüyün qan
Deyilmidir səndən, deyilmidir can?!
O alçaq işləri duyduqca vicdan,
İnsanın həyata qalmır həvəsi.

Ölən bir deyildir, eşit, ey cəllad!
Min bir yuvanı, bax, sən etdin bərbad,
İnsan! Nədir o səs! Nədir o fəryad? –
Dul qalan gəlinin odlu naləsi!

Sən ölmədin, qardaş! Ölmədin, inan!
Eşqin intiqamı yaşar hər zaman,
Qəlbimdən axan bu kiçik dastan
Arar qaranlıqda ədalət səsi!?

*1928*

## İLƏRİ...

Erkən günəş tellərini yer üzünə saçmadan,
Ceylanlar[*] öz sürüsüylə səhralara qaçmadan.
Mütəfəkkir düşünürdüm bir xəyalın izincə;
Bu yaz sabahı xilqətin təsvirinə gəlincə,
Hər şeydə həddindən artıq bir sükunət yaşardı,
Yalnız ayrı dağlardakı suların nərəsi vardı.

İştə, təbiətə bu gün hökm edən bir sükunət
Dünyaları qəhr edərdi bəlkə bulsaydı fürsət.
Azca keçməmişdi həmən minarənin başından
Ayazların şiddətilə donan soyuq daşından,
Möminləri çağırırdı ucalan "Allah" səsi,
O ənini[**] boğmadaydı zavodların nərəsi.

Artıq şəhər oyanmışdı... başlanmışdı hərəkət,
Harda hərəkət yaşarsa, orda yaşar bərəkət.
Qarşı dağın göbəyindən zər qanadlı bir pəri.
Gülümsəyən gözlərilə söyləyirdi "iləri!"

*1928*

---

[*] Ceyranlar
[**] Qəm, kədər ifadə edən inilti mənasında

# İKİ KÖRPƏ

Birincisi oynaq, qayğısız xoş üz,
İncə bir musiqi andırır səsi.
Yaşar gözlərində canlı bir gündüz,
Ətrafı güldürür hər qəhqəhəsi.

Yox onun qəlbində nə qərəz, nə kin
Bütün varlığında bir hərəkət var.
Şahin baxışları olduqca kəskin,
Sarsıdamaz onu nə çovğun, nə qar.

Digəri daha xoş bir qız yavrusu,
Lalədən rəng alıb gülür varlığı.
Onun nə dərdi var, nə də qayğusu,
Qazanmış əsrindən bəxtiyarlığı,

Mən bu səhnəciyə inandım gerçək,
Var imiş həyatın xoş zamanları.
Bizdən daha parlaq günlər görəcək,
Bu yeni dünyanın qəhrəmanları.

*1928*

## SAHİLDƏ

Ey vahi ki, ruhim yenə bir əski xəyalla...
Sevdayi o halla

Titrər və əsərkən qoca sahillərə baxdım.
Sellər kimi axdım.
Dəryada da qorxunc, dəli bir fırtına vardı.
Artıq su qarardı*.
Sevdalara, xülyalara bənzərdi bu axşam
Üfqümdəki hər şam,
Öz əksini salmışdı suyun bağrına, əlan
Fikrimdəki tufan
Dünyaları gəzmək deyə xülyalara vardı,
Bilməm nə arardı?..

[*1928*]

* Qaraldı

## HƏRƏKƏT

*Nazim Hikmətə*

Hərəkət!
Hərəkət!
Bu gün damarlarımı dolaşan
bu qan
Heç də dünənkinə bənzəmir, inan!
Fəqət mən yenə
enərək gecənin dərinliyinə,
Hər gün dolaşdığım ucsuz-bucaqsız,
odsuz, ocaqsız,
Tikanlı çöllərin bir yolçusuyam.
Eşit, ey!
aradığım şey
Artıq nə eşqdir və nə də hicran.
Bu hiss, həyəcan
qəlbimdən gəlmədi, fikrimdən doğdu:
Hərəkət!
Hərəkət!
Bu gün varlığımda dəmirdən möhkəm,
Tükənməz qoca bir qüvvə var desəm,
Çox da düşünməsin o afəti-can;
çünki hər insan,
Yaşamaq istəyən hər dərdli könül,
hər çiçək, hər gül
Azacıq sevinmək, çırpınmaq istər
Nə qədər dilbər,
qayğısız bir halım var bu axşam.
Qarşımdakı şam
azacıq sönməmək üzrə yanarsa,
bir an dayanmadan coşacaq qələm
Nə dərd, nə ələm,
nə də göz yaşları ənisim* deyil.

---
* Həmdəm, dost

Anla! Bil!
Bil ki, göylər nə qədər azad, bəxtiyar
ruhumla çırpınan bir əməlim var:
                    Hərəkət!
                    Hərəkət!
İncilin, quranın yarpaqlarını
Sovurur göylərə şimal yelləri.
Şərqin elləri
                    yaxın yazını
Bu gündən şöhrətli və şanlı bəklər.
Açan çiçəklər
artıq yaz gününə bir nişanədir.
"Cahan qəmxanədir"
                    fəlsəfəsi
                    son nəfəsi,
Son hıçqırığını çəkmək üzrədir.
                    Hərəkət!
                    Hərəkət!
Buludlar qoynunda himalaylar,
Səssiz gecələrdə ulduzlar, aylar,
Tənha bir şairin uzaq xəyalı,
                    şairlik halı,
Qüruba yaxın həzin bir mənzərə
                    susuz bir dərə,
Dağlarla qucaqlaşan əlvan buludlar,
                    yam-yaşıl otlar
Uçurar fikrimi dumanlar kimi.
Bunlar,
                    bu saydıqlarım,
Sən
və mən,
Hər ikimizdən törəyən,
Həp bu hərəkətdəndir,
Bu sonsuz sürətdəndir.

*1929*

## LEYLASIZ

Çökərkən axşamın qaranlıqları
Gözümdə bir qara bulud dolaşar.
Sənsiz xərab olan yazıq ömrümün
Hər dəqiqəsində bir ölüm yaşar.

Fəqət sən vüqarlı, süzgün bir gözlə,
İncidirsən məni cürbəcür sözlə;
Unutma, qarışar gecə gündüzlə,
O zaman ulduzlar, aylar sayrışar.

Nədir bu cəlalın, bu qiyamətin?
Nə qədər zalımsan, yox ədalətin.
Xəyalı güldürən o xoş qamətin,
İnan ki, şairə, şerə yaraşar.

*1929, 18 may*

## SƏHƏRƏ YAXIN

Yığılın başıma, qohum-qardaşlar!
Qoyun bir ah çəkim ərisin daşlar!
Mehriban insanlar, əziz yoldaşlar!
Bu çərxi-dövrandan aldım bir yara!

Gözəllər dünyası, dilim əzbəri,
Bəlalıdır başım əzəldən bəri;
Halıma yanmayan o gözəl pəri
Deyin üz qoyubdur hansı diyara?

Bilənlər bilir ki, bu yollarda mən
Ağrılar çəkirəm, hər səhər erkən –
Mənim yazıq ruhum ağlar, inlərkən
O mənim adıma deyir "avara".

Bumudur bəşərin vicdanı,bilməm?
Nədir bu çəkdiyim – bu bəla, bu qəm?
Ah, o könül quşu, o nazlı həmdəm
Bəlkə, bu dərdimə bulacaq çara.

*1929, 19 may*

## KÜR ÇAYI

*Sanılıya*

Ayrı dağlar kimi qol-qanad atan,
Coşqun dalğaları buluda çatan,
Qəmzələr göstərən, işvələr satan
Çox olur qonağın, yığnağın sənin.

Qorxunc qayaları yellər tək enən,
Günəşdən rəng alıb, ayla bəzənən
Nələr andırırsan bu gedişlə sən,
Şanlı, şöhrətlidir ocağın sənin.

Tiflisin arxası, Qazağın beli
Hər ikisi sənin, sənə dost eli ...
Boşalar qoynuna dağların seli,
Körpə bulaqlardır ortağın sənin.

Çoxları hüsnünə heyran qaldılar,
Çox igidlər səndən ilham aldılar.
Top-tüfəng atdılar, nərə çaldılar,
Keçdi o dəmlərin, o çağın sənin.

Ulduzlar qoynuna şəfəqlər saçar,
Səsindən ordular, karvanlar qaçar,
Sən gəzdiyin yerlər gül-çiçək açar,
Çünki uğurludur ayağın sənin.

Bağlanan yolların açılar hər yaz,
Səni görən gözlər səndən ayrılmaz.
Könlüm tək dalğalı, dəlisən bir az,
Alınır aləmdə sorağın sənin.

Ay doğub, sinənə kölgə salanda,
Deyər: “gülməmişəm sənsiz qalanda”.
Çobanın, naxırçın tütək çalanda
Gümrah olar yanın, yançağın sənin.

*1929*

# KAPİTAL

Hər zaman qəlbimi bir qüvvə əzir, parçalayır,
O mənim sinəmin üstündə ocaqlar qalayır.
Dağıdır fikrimi sərməst olaraq inləyirəm,
Bu uğursuz, bu köpəkdən daha qorxunc qüvvət,
Məni bir an belə duymaz və buraxmaz rahət.
Nədir aya, o nədir, söylə, nədir, ah nədir?
Kapitaldır ki, bəşər əski zamandan bəridir.
Ona bir Tanrı qədər səcdə qılar, hörmət edər,
Ən uzaq bir günəşin kölgəsini seyrə gedər.
“Dəli şair” də həyatın bu sönük kölgəsinə,
Çox zaman aldanaraq qoşdu onun səcdəsinə.

Kapital məncə qərəzdir, kindir,
Bir mələk olsa da pək çirkindir.
Nə qədər varsa da dünyada bu səs,
Ala bilməm ki, mən azadə nəfəs.
Komsomol! Sərvətə can vermə, sakın!
O ilandır, ona sən durma yaxın.
Sənə alqış, sənə qüvvət, sənə can,
Sənə sönməz əbədi bir həyəcan.

[*1929*]

## ŞƏRQİN QAPISI

### ŞƏHƏR OYANIRKƏN

Günəş qısqanaraq ürkdü gecədən,
Boğdu qaranlığı, can aldı yenə.
Şair ən inadkar bir çocuq kimi
Endi xəyalının dərinliyinə...

Qayıqlar sahildə səssiz-səmirsiz...
Uzaq yollar gələn yolçular kimi;
Sakit bir yuxuya getmişdi dəniz,
Dərin bir məqsədi, fikri var kimi.

Bənzərdi ən böyük, ən xoş əmələ
Günün üfüqlərdə alışan rəngi.
Söylədi: keçmişdən əsər var hələ, –
Uzaqdan çalınan kəlisa zəngi.

Ağardı kainat günəş gülərkən
Qalmamışdı göydə nə ulduz, nə ay;
Gündüzün eşqilə hamıdan erkən
Səkirdi quş kimi yerdə tramvay.

Çoxaldı get-gedə, artdı hərəkət,
Artıq keçinmişdi gecənin qəlbi;
"Qudok"un səsindən canlanan sürət
Andırırdı sağlam, polad bir qəlbi...

Azacıq keçmədən cəsur insanlar
Qoşdu iş başına, tərpəndi şəhər...
Ucaldı göylərə qara dumanlar,
Həyatı yaşadar çalışqan əllər.

## AXŞAM

Günəş çəkilirkən dağlar ardına
Üfüqlər qaraldı, sular qaraldı...
Dedim: bir şey yazım – həyat adına.
Bu axşam fikrimin qanadı vardı.

Duyurdum hər gözdən bir hissi-hörmət,
Xəyalım ən yüksək şeylər andıqca.
Duyurdum fikrimdə böyük bir qüvvət
Xəzər ləngər vurub dalğalandıqca.

Təbiət nazənin, təbiət dilbər,
İnsanlar qayğısız, həyat bəxtiyar.
Sevirəm əsrimi, – söyləsəm əgər,
Bir şair qəlbinin buna haqqı var.

## MƏDƏNİYYƏT SARAYI

Xumarlandı gecə, istilər söndü,
Yüksək buludlardan gülümsədi ay.
Canlı insan kimi dil açdı birdən
Gördüyüm bir bina, bir yüksək saray.

Danışdı radio Çindən, Əfqandan,
Səsləndi qəlbimin sədəfli sazı;
Ən sonra gəlirdi ta uzaqlardan
Neyin şikəstəsi, tarın şahnazı.

Deyirlər burada, bu şən sarayda,
Vaxtilə güllələr, bombalar varmış.
Duyğusuz insanlar qışda və yayda
Haqq istəyənlərə atəş açarmış.

Deyirlər qan içən ağır zamanlar
Böyük bir kütlənin başına darmış;
O kəsilən başlar, tökülən qanlar
Duyan ürəkləri çox ağladarmış.

## SON SÖZ

Sən ey mədən torpağından qüvvət alıb gülən diyar,
İgid ərlər meydanısan, qəhrəmanlar yuvasısan.
Səndə sönməz bir əməlin göylər qədər mənası var,
Sən inqilab ocağısan, əməkçilər obasısan.

Qarlı dağlar şahid durur keçirdiyin dövranlara,
Çox zamanlar zülm elinin bir kölgəsi sayılmısan.
Dənizlər dalğalandıqca, səs düşdükcə ormanlara,
Xoş baxışlı bir günəşin gülüşündən ayrılmısan...

Ancaq unutma bir şeyi, unutma ki, bu dünyada
Ehtiyatsız bir gözəli qara yellər tez soldurar.
Burjua qanlı bir dəniz, sən ortalıqda bir ada,
O dalğalar zaman-zaman sənə coşar, səni vurar.

Gözəl ölkəm! Sən gözəlsən, gözəlsən öz əməlinlə.
Zəncirlərdən azad olan bir dünyanı yapasısan.
Bu da mənim son sözümdür, dinlə məni, bir az dinlə:
Sən bu sağlam şüurunla qoca Şərqin qapısısan.

*1929*

## DOSTLAR XƏBƏRİ

Bir xəbər almışam dostlar elindən:
Əğyarın başına dünya dar olub.
Gedibdir əlindən hər ixtiyarı,
Pozulub şövkəti tarımar olub.

Mən demişdim ona: eşit, ey insan!
Qalmayacaq sənə sürdüyün dövran.
Bilir Azərbaycan, bilir Dağıstan,
Dərdim el içində bir şüar olub.

Arif ol, ey Vurğun, uyma şöhrətə,
Alışdır özünü barı möhnətə;
Bir bax tarixlərə, bax təbiətə
Ağ günlərin sonu ahu-zar olub.

Artıq bu sözlərin nə mənası var?
Başımda bir köhnə qəm havası var.
Onun Vurğun kimi mübtəlası var,
Bir baxın ki, gedib kimə yar olub?..

*1929, 16 sentyabr*

# ÖLÜMÜN MƏHKƏMƏSİ

Soyuq bir qış axşamında süzərək kainatı,
O, mənalı baxışlarla tərk elədi həyatı...
Acımadan gəncliyinə parlaq əməllərinə,
Həyatını qurban verdi öz qatil əllərinə.
Sayğısız bu yaramazlıq, ömrün bu iyrəncliyi
Gələcək günlər eşqinə düşündürdü gəncliyi;

B i r i n c i  s ə s

O bizim kəndliydi, ta çocuqluqdan
Birlikdə çalışar, əkin əkərdik;
Yaşıl yamaclarda, dağlar başında
Bir deyib, bir gülüb ləzzət çəkərdik.

Uğursuz bir gündə acı bir külək
Dağları, daşları bir yerə qatdı;
O soyuq ruzgardan xəstələnərək,
Yazıq il yarımdan ziyadə yatdı.

O gündən bəridir təbiətində,
Doğrusu, düşkünlük ağırlıq vardı;
Seyrək eşitdiyim hər söhbətində
Ölüm düşünərdi, ölmək arardı.

İ k i n c i  s ə s

O çox mütəfəkkir, çox xəyalpərvər,
Həyata, hər şeyə biganə idi.
Görüb düyduğumu söyləsəm əgər,
Bəlkə bir sayğısız divanə idi.
Ömründə bir dəfə gülməzdi üzü,
Çünki dumanlıydı düşüncələri.
O bir qarşılardı gecə-gündüzü
Dadlı xəyallara uyandan bəri ...

Ü ç ü n c ü   s ə s

Əsrin geniş addımları sürət tapandan bəri
Çoxlarına çətin gəlir mübarizə günləri;
Axan sellər qarşısında aciz, miskin qalırlar.
Sonra sonsuz bir heçlikdən dönüb “ilham” alırlar.

Həyatı bir kölgə kimi, röya kimi duyanlar,
Çətinlikdən çəkinib də hər xəyala uyanlar
Yeniliklər dünyasına yummaq istər gözünü,
Anlamaz ki, bu gedişlə o aldadır özünü ...

*1929*

## ÇÖRƏK DOSTU

Bir az yeyər, içər keyfi durular,
                                        açılar rəngi,
Sonra sərməst olub, qızar gözləri.
                                        Onun sözləri
O qədər mənalı olur ki, inan,
                                        Hər duyan insan
Fəxr edər bəşərin bu övladilə,
O da insanlığın böyük adilə,
                                        Bizi alqışlar,
                                        nitqlər başlar:
"İçək bu bakalı o sağlığa ki,
Xəyalı yüksəkdir, qəlbi ləkəsiz,
Əyilməz bir kəsə qalsa əkməksiz*".
Yazıq üzülüncə meyxanalardan
Büsbütün dəyişər, dönər ahəngi,
                                        açılmaz rəngi...
Təəccüb gəlməsin sizlərə bu iş,
Onu danışdıran meyxana imiş.

[*1929*]

---

* Çörəksiz

## VƏTƏN HƏSRƏTİ

Elindən, günündən ayrılan könül,
Arabir vaxt tapıb ağlasın gərək.
Əziz kimsələri qırılmış kimi,
Yas tutub qaralar bağlasın gərək.

Demirəm incidib üzsün özünü,
Əl üzüb dünyadan yumsun gözünü.
Nə qədər olsa da Vətən sözünü,
Duysun ürəyində, anlasın gərək.

Bir şikəstə neyəm, bir qırıq kaman,
Görmədim bir bəla-həsrətdən yaman,
Vurğun ellər deyib ağlar hər zaman,
Onun qaydasıdır, ağlasın gərək.

*1929*

## SƏFİL QADIN

Oxuyun!
Oxuyun şerimin
sizə bağışladığı həyat səhnəsini,
Oxuyun onun
xəyala hökm edən odlu səsini.
Mən söylədiyim,
söyləmək istədiyim bu səhnə
köhnə, pək köhnə
Fahişələr yurdundan bir nümunədir,
O nədir?
Ağarmış saçında qarlı qışların,
boranlı günlərin kölgəsi yaşar
Ölgün gözləri göylərlə qucaqlaşar.
Çünki yerdən,
yerdəki cinayətdən,
hər qanundan, hər adətdən,
Yemiş dönə-dönə və diksinmişdir.
Kinli gözlərdən uzaq,
pək uzaq bir küncə sinmişdir.
Ey qadın!
Ey ana!
Bu gün sana
soyuq baxan gözlər daşamı döndü?
Yoxsa gözlərinə çirkinmi göründü?
Dedilər sən böylə deyildin əzəl,
Çiçəklərdən təmiz, güllərdən gözəl.
Bəlkə də arxanca titrəyib qoşan
illərin yorğunu bir könül varmış.
Fəqət indi?
Belin bükülmüş,
saçın ağarmış,
Nə dərdini bilən var,
nə üzünə gülən var!

[*1929*]

## İNQİLAB YURDU

Dedilər hər sabah, hər axşam yenə
Baxırsan yollara həsrətli gözlə...
Mən də az anmıram o günləri ki,
Alardın könlümü bir şirin sözlə.

Söylə, yadındamı o zaman ki, mən
Əlvida söylədim tanışlarıma;
Duydum ki, inlədin, sızladın qəlbən,
Dönüb göz gəzdirdin baxışlarıma...

O gündən bəridir heç görüşmədik,
Mümkünmü duymamaq keçən günləri?
Nə bir danışmadıq, nə gülüşmədik
Ayrılıq hökmünü verəndən bəri.

Get, – deyirdi mənə o baxışların,
Hicran günlərinin ömrü az olar.
Qaydadır, boranlı, qarlı qışların
Sonunda çiçəkli, güllü yaz olar.

O sözün ağlımı yığdı başıma,
Unutdum hər eşqi, unutdum yarı;
Bir yeni kainat çıxdı qarşıma
Öpürkən alnımı şimal ruzgarı!

Başqadır burada həyat, hərəkət,
Yazamam günlərin bu sürətini,
Dünya dəyişmişdir, dönmüşdür əvət!
Torpaqdan almışdır öz qüdrətini...

Bu yerdə nə hicran, nə qayğı, nə qəm,
Nə Sənan eşqi var, nə də intizar;
Böyük fikirlərlə məşğuldur aləm,
Bəşərin ölməyən dühaları var!..

Söylə, nə göstərim bu günə dair?
Könüllər sərbəstdir, duyğular azad...
Bu yeni dünyanın yolçusu – şair
Dərdli günlərini heç edərmi yad?

Budur bax, gözlərim qəlbim kimi şən,
Bütün kainatım, bütün varlığım,
Sanasan çiçəkli, güllü bir gülşən...
Bitib-tükənməyir bəxtiyarlığım.

İndi mən ömrümün bahar çağları
Bilmədiklərimi bilirəm burda;
Könlüm çox axtarır uca dağları,
Bir gün dönəcəyəm çıxdığım yurda...

*1929, 26 noyabr*

## KONSERT AXŞAMI

Gecəydi...
Moskva hər günkü kimi
insan dalğasilə dalğalanırdı.
Kim bilir, fikrim
nələr düşünürdü, nələr anırdı?
Yorğun-arğın insanlar
işdən sonra
Yığışmışdı, divarları
daş aynalı bir salona
Konsert olacaq!..
Ömrün varlığını izləyən şair
bu günə dair
nə isə düşünürdü haman salonda.
Bu axşam onda
büsbütün başqa bir həyəcan vardı,
Həyata çox sağlam inamı vardı.
Bu aralıq
Bütün varlığilə gümrah, qayğısız,
səmimi bir qız
ona yaxınlaşaraq.
– Bayaq sizi göstərərək arkadaşım söylədi ki,
O sadə gənc uzaqlardan, Şərq elindən qonaq gəlmiş;
Məqsədiniz bu torpaqdan qüvvət alıb dönmək imiş.
Söyləsəniz çox xoş olar, düzmü onun dedikləri?
Hansı qüvvət, hansı məqsəd bu yerlərə çəkdi sizi?
Düşündürün bu xüsusda, azca əyləndirin bizi.
Şair:
– O yerdə ki, günəş gülər, dəniz gülər, göy gülər,
O yerdə ki, sarı bülbül yaz gününü qarşılar,
O yerdə ki, quşlar oxur, söylənilən türkülər,
Andırır ki, o torpağın zəngin təbiəti var;
Axşamları, səhərləri çox xoş olur, o diyar –
Hər könülə ilham verər, hər yolçunu saxlayar.

O, Qafqazdır ki, şairlər vurulmuşdur nazına,
Könül oynar ixtiyarsız təbiətin sazına.
– Heç anırmı xatiriniz o nəşəli günləri?
Sıxılırmı varlığınız?
– Heç sormayın onu siz!
Yenə dalğın xəyalımdan nələr keçdi bilsəniz!
O zaman ki, çiçəklərin arasında bəxtiyar
Dolaşırdım öz-özümə, coşub əsdikcə ruzgar;
O zaman ki, məni Günəş salamlardı yar kimi,
Çırpınardım ürəyimdə bir xəstəlik var kimi...
O zaman ki, qarlı dağlar örtünərdi dumana,
Dənizlərin dalğasından səs düşərdi ormana,
Uca, qorxunc qayalardan ilham alıb yazardım;
Qaranlıqlar çökən zaman düz yolumu azardım;
Gecələrdim təbiətin qucağında çox zaman,
Mən nə idim, bir çöl quşu...
– Çöldə yaşarmı insan?
– Köçəridir xalqımızın çox hissəsi əzəldən,
Nə söylədimsə doğrudur, yaratmadım bunu mən.
Günəş azca qızan kimi çəkilərdik bağlara,
Dağlar bizə mehribandır, sığınaraq dağlara.
Üç ay yayı keçirərək göy yaylaqlar başında,
Yurd salırıq o yerlərin torpağında, daşında.
Şahinlərin qıy vurması, buludların axması,
Uzaq-yaxın üfüqlərdə şimşəklərin çaxması,
Ürəklərə nəşə səpər, könül səadət izlər;
O yerlərdə cana gələr sarı, solğun bənizlər...
Nə zaman ki, arabalar köç yoluna düzülər,
Kəndli yoldaş əkinindən, biçinindən üzülər,
Yazlıq əkin işlərini unudurlar tamamən.
Yaşamışam dönə-dönə çox görmüşəm bunu mən.
Tarladakı sünbülləri dənlər köçəri quşlar,
Gecələr çox səssiz olur, yalnız ular bayquşlar.
Yayın orta aylarında gün otları yandırır,
Hərəkətsiz o təbiət məzarlığı andırır.

Salon səssiz bir hal aldı, hərəkətdən əsər yox.
Səhnədəki oynaq bir gənc söyləyirdi monoloq:
– Buludlar oynaqdır, sanma şaşqındır.
Dənizlər dalğalı, sular daşqındır;
Həyat dedikləri hərəkətdədir,
Bu ölməyən qanun təbiətdədir.
Fikirlər, duyğular, əməllər hər an
Dönər, təzələnər, çünki hər insan,
Dünyada hər könül yüksəliş arar,
Varlığın nə ilki, nə axırı var.

*1929*

# ƏMƏK VƏ TƏBİƏT

Günəş doğub yayılmadan qayaları dələrək
Balta vurar, külüng çalar yorulmayan qolları.
Elektrik qüvvəsindən min bir cana gələrək,
O hazırlar yer altında şöməndüfər* yolları.

Sonra qatar sürətilə trak... trak... tra... rak...
Elçiləyər uzaqları dağı, daşı yırtaraq.

Quş qonmayan o dağlar ki, nərəsindən yıxılar,
Buludların rəngi qaçar bu sürətin səsilə;
Nə yoruldum söyləyər o, nə də qəlbi sıxılar,
Yıxar, qurar təbiəti bu günün nəğməsilə.

O bilir ki, döyünməyən, hərəkətsiz bir ürək,
İztirablar keçirirkən mumlar kimi sönəcək;
O bilir ki, bu dünyada bəslənilən hər dilək,
Çətinlikdən çəkinərsə bir xəyala dönəcək.

Odur ki, bax, güvənərək qolundakı qüvvətə,
Dəyişdirir kainatı, yeni bir donda qurur.
Dalğalanan bu axın ki, məni salır heyrətə,
Zaman axır sular kimi, saatlar çox tez vurur.

Əsrlərin qurduğuna qarşı duran bu sürət
Güldürəcək, şübhəsiz ki, görüb duyan kəsləri;
İnsanlığın qüdrətinə təslim olur təbiət,
Şair nəşə içindədir, duyur zəfər səsləri.

*1929*

---

* Dəmir yolu

## ELLƏR DÜNYASI

Al-yaşıl geyinmiş uca dağların
Qartallı qoynundan uzaqlaşmışam;
Könül bulandıran, xəyal küsdürən
Tozlu bir diyarla qucaqlaşmışam...

Burada hər tərəf – yerdən göyədək,
Doğrudan yandırır, yaxır insanı;
Acı bir hiss ilə gülümsəyərək,
Deyirəm: gəzdiyim o yerlər hanı?

Hanı ağ suların xoş təranəsi?
Burda nə ildırım, nə şimşək çaxar:
Yadıma düşdükcə Dilcan dərəsi
Başımdan tüstülər, dumanlar qalxar.

Gecələr ay gülməz buludlar qara,
Boğulur varlığım hər bir addımda.
Mən çox dırmanmışam qarlı dağlara,
O ellər dünyası yaşar yadımda...

[*1929*]

## SƏRİYYƏNİN ÖLÜMÜ

Mən görmədim, söyləyirlər bir gecənin sonunda
Sənə qıyan mərhəmətsiz, soyuq bir əl qudurdu.
Bu gün qurmaq istədiyin yeni həyat yolunda,
Ağ sinənə sağalmayan isti yaralar vurdu.
Dalğalandı bu xəbərdən xəyalımın dənizi,
Uzaq-uzaq keçmişləri xatırladım nifrətlə...
Bu hal mənə düşündürdü hər qulu, hər kənizi,
Ancaq mən öpdüm onları şerimdəki hörmətlə...
Mən görmədim söyləyirlər hənuz körpə yaşında,
Ayrılaraq can evindən altunlara satıldın:
O qaranlıq gecələr ki, gəlib durdu qarşında,
Sevmədiyin bir qocanın qollarına atıldın.
Sən sizi çəkdiyin soyuq ahlar buludlara toxundu,
Baxdım ömür dəftərinə, nə dastanlar oxundu...
O gündən ki, al şəfəqli bir günəşin dalğası,
Buludların arasından sıyrılıb cilvələndi,
O gündən ki, məzlumların safa çıxdı yarası,
Başqa bir göz salamladı hər şəhəri, hər kəndi.
Artıq sənə ilham verdi, yeni həyat, yeni saz,
Sən də sevinmək istədin, gülmək istədin bir az;
Məbədləri, məscidləri, Məhəmmədin dinini
Ayaqladın şərqə məxsus əfsanələr yurdunu...
Saf havalar udmaq üçün, unutmaqçün dərdini
Sən atıldın klublara, el, oba gördü bunu.
Uzun qara saçlarını parça-parça kəsərək,
"Yetər əyləncə olduğum!" – deyə bir gün bağırdın.
Bu tufanlar əsrində sən yellər kimi əsərək,
Qımıldandın dodaqaltı, xoş mahnılar çağırdın
Və beləcə gündən-günə aşıb-daşdı əməlin,
O səfalət yuxusundan diksinərək oyandın.
Nə yazıq ki, çox sürmədən ən duyğusuz bir əlin,
Dayanılmaz zərbəsilə qızıl qana boyandın.





## TABUT KEÇİRKƏN

Sarılıqlar çökmüş kimi buludların rənginə,
Günəşdən yox bir nişan;
Bütün aləm pərişan...
Ağır karvan yürüşilə dalğalanır insanlar,
Həm də qızlar, oğlanlar,
Komsomollar, pionerlər, məktəblilər, qadınlar
Öndə gedən bir tabutun arxasınca addımlar...
Dalğalanırdı Bakı,
Onun qarşısındakı
Salamlanan bu tabut ki, azadlığa verdi can,
Hər gözdə bir həyəcan,
Hər baxışdan kin püskürür o qatil qəlbə qarşı,
Çalınır matəm marşı...
Həzin-həzin bu nəğmədən döyünürdü ürəklər,
Çıldıran bir quduz kimi səslənirdi küləklər...

*1930*

## MƏKTUB

*Nəşədir yaşamaq, nəşədir həyat!*
***Mikayıl Rəfili***

Nə qədər "xoş gəldi" qulaqlarıma
Bir əfsanə qədər dadlı sözlərin...
Duyduqca dərin,
Dərin bir yalan var bu sözdə, yalan!
Çılpaq çiyinləri günəşdə yanan
Zəncirdəki zənci deməzdi bunu!
Deməzdi, inan!
Küləkləri zəqqum qoxuyan
                    qum çöllərinin,
Görmədiyim,
Fəqət tanıdığım şərq ellərinin
qocası və gənci deməzdi bunu!
Fəqət sən,
Sən dedin, ey "şair",
                    bunu kef üstdən...
Çünki sən.
qızğın qurşunlara sinə gərmədin,
Atlı nəfərlərə yol göstərmədin...
Çünki o yolu,
O yol ki, varlığı üsyanla dolu,
sən görmədin o yolu
Yumşaq və ağ dərin
İpəklər içində xumarlandıqca,
Yosma gözəllərə dastanlar dedin,
Nəşələr yedin!
Görmədin meşin jaketli
rus işçisinin qızıl
                    gülləsini,
O top-tüfəng səsini.
Görmədin sən,
Aclığından dişləri kilidlənən

Qatar-qatar
bölük-bölük,
yığın-yığın canları,
fədakar insanları;
Sən görmədin o ili,
Görmədin, Rəfili!

* * *

Rəngi qan,
qəlbi qan,
Göylərin ən qatı qatına qalxan,
Bir günün zərrəsindən,
tufanların səsindən
yaranan bu həyat qanadlandıqca,
Yolçular atlandıqca,
Bu axın səni də aldı qoynuna;
Sənsə "ona könül verdin
və sarıldın boynuna"...
Dəyişdi adət,
Gəzdi ürəkləri sevinc, səadət.
Al saçaqlı şəfəqlərə bələndin,
Sevindin,
nəşələndin...
Gözlərinə
Sarı bir eynək taxdın
Həyata hər şeyə biganə baxdın...
Ancaq eşit
Söyləyirik biz;
Bu gündən sonradır mübarizəmiz.
Yalandır həyatı nəşədə duymaq,
Yalandır həyata nəşədən uymaq!

*1930*

* * *

Dinlə məni, gözəl bahar!
Qəlbinlə dinlə.
Sənə deyiləcək
sözüm var:
Bilirəm sən,
mənim ilk sevgilim kimi,
İlk duyğularımın şahidisən!
Unutmadım sizi mən.
Unutmadım
adımı dolaşıq çağıran
suların düyümlü səsini...
Mənə çox görməsin zaman
Çalışıb yaşamaq həvəsini...

*1930*

## ŞAİRİN SƏSİ

*Mikayıl Müşfiqə*

Axşamdan bəridir könlümdə yenə
Hirsli fırtınalar, qasırğalar var.
Çox da uymayıram könlüm deyənə,
Gözlərim hər şeydə bir hikmət arar.

İçim dalğalanır sanki bir dəniz,
Mən bu dalğalarla qucaqlaşıram.
Nələr düşünürəm, duya bilsəniz!
Sanki varlığımdan uzaqlaşıram...

Bəzən də fikrimin qanadlarını
Küləklər qoparıb, qaldırır göyə.
Sürürəm əsrimin qır atlarını,
"Bu axın başqa bir axındır", – deyə,

Bütün arzularım gülür yarına
Xəyaldan ilhamlar almamaq üçün;
Baxıram Leninin kitablarına
Dəstədən geridə qalmamaq üçün.

*1930*

## DÖNÜŞ

Ah, nə zaman ki, duyğularım ac,
Gözlərim səmimi bir şerə möhtac,
Dolanır günlərim;
                    Duyuram bəzən
Gizli varlığını kölgələr gəzən
Yapma bir gözəllik.. Xəstə bir əməl...
O çağırır məni, söyləyir: gəl, gəl!
Yazıq bilməyir ki, unutdum onu,
O sonsuz gecənin yox imiş sonu.
Haydı get!..
                    İndi mən uzaqlarda tək
Yaşaram; kimsəsiz yaxamdan əl çək!
Sənin xəyalınla od tutub yanmaq,
O yalan varlığa bir də inanmaq
Nə qədər gülüncdür.
                    Şöhrətinlə sən
Yenidən qəlbimə hökm edə bilsən
Mən bu həqiqətə təslim olmaram.

*1930*

## BİR AZ GÜLMƏK ÜÇÜN

*Qardaşım Osman Sarıvəlliyə*

Söylə sən ey, təbiət! Yoxmu sənin günəşin?
Bu qaranlıq gecələr həmişəlikmi əşin?
Mən də bir insanam, ah! Məna ver sözlərimə,
Bəlkə də kor kimiyəm, işıq ver gözlərimə,
Mən də görüm varlığı, Ayı, Günü, ulduzu;
Hər çiçəyi, hər gülü, hər qadını, hər qızı
Oxşamaqdan yoruldum;
                    Başqalaşmaq istərəm.
Qanadlı bir quş kimi dağlar aşmaq istərəm.
Arzularım çoxalır, mən acizəm uçuşda,
Karvanım çıxdı yoldan bir çıxılmaz yoxuşda...
O qaranlıq gecədə mən itirdim yolumu,
Həyat bükdü belimi... Həyat qırdı qolumu...
Sən ey quduz təbiət! Sən ey zəhərli ruzgar!
Bu nəşəsiz günlərin, söylə, nə mənası var?
Bəlkə də hər bir ağ gün bir qara gün deməkdir...
Bəlkə də hər şirinlik bir acılıq yeməkdir...
Bəlkə yalandır Günəş, həqiqətdir gecələr,
Yordu mənim beynimi bu saysız bilməcələr.
Sorsalar bu pərdəli fəlsəfələr neçindir?
Deyin bu göz yaşları bir az gülmək üçündür.

*1930, 5 dekabr*

## MƏN HAZIRAM

Bu gün mənim
Sağlam bədənimdə qan-tərə batan
Və yatan
Bir saat kimi
qəlbimi
Bir şad xəbər salamladı:
Dedilər: "Sinif qovğasıdır"
Gələcək hərbin adı.
İgid bir əsgər
və qəhrəman
Bir komandan kimi bəzən
İçimdə mən
Qalın və dolama yollar aşaraq –
Şrak!
Şrak!
Şrak!
Atılan güllələrə sinə gərirəm,
Düşmən ordugaha yol göstərirəm
və deyirəm:
Qollarında qüvvət,
Ürəyi sağlam bir gənc üçün
Yaralanmış bir göyərçin kimi
Qanadlarını sallayaraq
Ucuz ölmək gülüncdür.
Burax, dedim –
Məni burax!
Dayanılmaz hərəkət...
Azad nəfəs aldığım bu məmləkət
Halal etməz igidlərin qanını,
Mən hücumdan geri qalsam!
Dəmirdir əsam.
Nişan alsalar da gözlərimin qarasına –
Bolşevik qəlbimlə,
hazıram mən də
Gələcək sinif qovğasına!

*1930*

## MƏN DƏ BİR ƏSGƏR KİMİ

Nəbilərin,
krallların,
şahların
ölümünə qərar yazırıq!
Biz
hərb istəmirik,
hərbə hazırıq.
Yoldaş firqə!
Qanımız,
canımız,
bütün həyəcanımız
Günəşin istisilə doludur.
Bizi
Qaranlıqdan
işığa çıxaran
və hər zənciri qıran
Son məqsədin
son yoludur.
Bu yolun yolçusu
daşqın bir su
Və dənizlər kimi dalğalanan,
Dəmir qapılardan intiqam alan
Proletar!..
Bölük-bölük,
qatar-qatar
çoxaldıqca nəslimiz,
Dünyanın hər yerində biz.
Gözlərimiz ayıq
oxumalıyıq
beynəlmiləl havasını,
Bu
son əməl
havasını.

Qoy
qarımış kapitalın
Çürük
və laxlamış
dişləri ağarsın...
Qoy
onların,
O ipək döşəməli
salonların
hər bəxtiyarlığı,
bütün varlığı
heçliyə varsın!
Qoy
dəmir barmaqlarımız
Soyuq
və qaranlıq gecələrin
bağrını dəlsin!
Düşmən qüvvələr
qarşı-qarşıya gəlsin
və başlansın
Yerləri,
göyləri
titrədən bir hərb;
Cənub,
Şimal,
Şərq,
Qərb
Bölünsün iki düşmən
və barışmaz cəbhəyə!
O zaman
mən
"daloy istismar!" – deyə,
qızıl süngümü soxmalıyam
piyli və yekə qarınlara!
Vurduğum yara

gərək bir də sağalmasın!
Düşmən ordugahdan
nişan qalmasın!
Nəbilərin,
krallarin,
şahların
ölümünə qərar yazırıq!
Biz hərb istəmirik,
hərbə hazırıq!..

*1931*

# RAPORT

*Bakı mədən işçilərinə*

GİRİŞ

Mən
nəfəsləri benzin
və kükürd qoxulu
milyonların şairiyəm,
Düşməniyəm onların –
Divarları məxmər
və ipək döşəməli
salonların...

RÜCU*

Vur,
dedim, vur!
Zərbələrini
bərk vur!
Mənim arzum budur:
Qollarına
yeni qüvvələr gəlsin,
və sənin
əlinlə yüksəlsin
Kirli,
yamalıqlı kəndimiz,
üklü,
alıqlı kəndimiz!..

SALAM

Salam sizə!
Sizin qəlbinizlə
yaşayan,

* Müraciət

və matorlu kəlmələri
çiynində daşıyan
yeni şerin
yeni şairindən
salam!
Şöhrətim kəndli!
Qapımız ömründə
xırman görmədi
məhsullu
və bərəkətli...

Yaşatmadım
qanadımın altında
bir an,
Ustamızın yolundan
sapanları,
və qurtuluş gününü
keçmişdə tapanları.
Mənə
bu dərsi
verdi zaman.
Qırdım zaman-zaman
gözlərimə dolaşan
biri çaş,
biri sarı
gözlüyü mən.
Sirrini görmədiyim dünya
Gözlərimə
göründü yenidən;
Unutdum
tüstülü daxmasında
yemlik yediyim
Babamın
aciz xülyalarını.
Unutdum
o səfil gecələrin
sərxoş röyalarını

və təkrar
anmadım
adımı dolaşıq çağıran
suların
duyumlu səsnini..
Mənə
çox görmədi zaman
çalışıb
yaşamaq
həvəsini...
Gördüm
damarlarımı dolaşan
o köhnə qanın
və onu yaradan
köhnə romantikanın
ən xəstə qurdunu...
Öldürdüm onu!
Öl-
dür-
düm!
Və dedim:
"Tarixi yaradan
insanlar özüdür".
Bu,
ən böyük
ustamızın
ən böyük
sözüdür.
Yenə dedim:
Əlimi mən də verməliyəm
işçilərin əlinə;
Mən də
daş atmalıyam
Sosialist
Vətənimizin
təməlinə!
Alqış!

Dəmir əllərilə
daxmaları sökən,
yerində saraylar tikənlərə!
Ölüm!
Sarı gözlüyünə
qaranlıq çökən,
gözünü köhnə dünyanın
heçliyinə dikənlərə.
Alqış!
Sosialist yurdumuza,
Kanallar çəkən,
İlanlı çöllərdə
ağ pambıq əkən
zərbəçilərə!
Ölüm!
Başını paçasının
arasında saxlayan
Və ömrü
yumurta kimi
laxlayan
tək atlı çərçilərə!
Vur,
dedim,vur!
Zərbələrini
bərk vur!
Mənim
arzum budur.
Qollarına
yeni qüvvələr gəlsin,
və sənin!
əlinlə yüksəlsin
Kirli,
yamalıqlı kəndimiz,
üklü, alıqlı kəndimiz.
Hey!..
Hey!..
Addımlarını möhkəm at!

Sənin çiyinlərində yüksəlir
                bu yeni həyat!
Bu həyatda gördüm:
Kirli gömləyini əynindən atanların
döşündəki beş bucaqlı qırmızını.
                Ayaqları dolaşa-dolaşa
                məktəbə gedən
anamın qalstuklu qızını.
Gördüm
                adsızlığını
                və savadsızlığını
                ləğv edən,
Kəndimizə
                özək katibi gedən
                bolşevik işçiləri.
Günlər
axır
irəli!..
Görəcəyəm:
                canındakı
                sönməyən həvəslə,
və kolxoza birsəslə
                yazılan əməkçilərin
                ağ saçlı qarısını.
Mən
onları duymaqla keçirdim
ömrümün yarısını...
Görəcəyəm
Quduran
və bığlarını kişmişlə buran
əyriburun
                hampaların ölümünü,
                onların son gününü.
Zaman axıcı bir su,
                görürəm bunu.
Dəyişir
                və dönür

Bəşər fikri,
bəşər duyğusu.
Zaman axıcı bir su...
Bu suyun
ən qüvvəli
motoru
və requlyatoru* –
Proletar ordusu!
Zaman axıcı bir su!
Hey!..
Hey!..
Addımlarını möhkəm at!
Qat-qat çoxalt
Kəndimizə yaraşıq
və işıq
verən elektrik tokunu.
Mən
onlara bağışlayım
şerlərimin çoxunu
və yazım:
bu tok,
bu toku yaradan "blok"
İşçi-kəndli birliyidir!
Bu birlik
şəhərlə kəndin
ən gözəl diriliyidir!
Qoy
kəndimizin üstünü
Bulud kimi bürüyən
və ətəyini sürüyən
dumanlar
Dağların ardına çəkilsin!
Kəndimizə su gəlsin,
dəmir yolu çəkilsin!

* Nizamlayıcı

Qoy
minsin elektrik qatarına
Sabaha salam versin
Yarışa çıxanların
            zərbəçi dəstəsi.
Sabahı da
bu gün kimi,
qura-qura
Söyləyək:
Ura! Ura!!!

*1931*

## ÖLƏN ŞEİRLƏRİM

*“Tərbiyəçi olmaq üçün*
*tərbiyə olunmaq lazımdır”*
***K.Marks***

İncə bir bahar buludunu andıran
və gəncliyi
bir göl kimi dalğalandıran
mavi gözlərə
Yazdığım dastanlar
Bu gün məndən uzaqsınız.
Sizi mən
ölən
günlərin heçliyinə
öz əlimlə göndərdim.
Vərəmli
və sıtmalı gecələrimi
günəşli gündüzlərə döndərdim –
“Dürrənin səsi”,
“Dilican dərəsi”,
“Gözəllərim”,
“Qəzəllərim”,
...lərim..., lərim...
və nələrim...
Artıq gözlərimdən uzaqlaşdınız;
Ölən bir cahanla siz
gülüşsüz qucaqlaşdınız...
O gün mən,
ağır
və ən
çətin dəqiqələrə qatlandım.
Sərt
və oynaq küləklər kimi,
mən də qanadlandım.
Bu bir uçuşdur!

Fikrim
ruzgar, qanadlı bir quşdur.
Axsadığım günlər oldusa bəzən
mən yıxılmadım,
Tarixə bolşevik yazılsın adım!
Bayrağım
damarlarımdakı qanlar kimi qırmızı,
Polad nəslimizin varlığı beton!
İnanmadı gələcəyin bu gününə
nə Berkley.
nə Platon.
Kapital
qotur itlər kimi tükünü tökür;
Onların uzağı görməyən gözlərinə
qaranlıq çökür...
Tarix
açır xəyanətini sosial-faşistlərin.
Bu xəbər üşüdür varlığını
menşevik "kommunistlərin".
Belə bir gündə
mavi buludların rənginə uymaq
və gecələrin sarımtıraq,
Çarpaşıq görünüşündə
həyat duymaq
Yaramaz!..
Odur ki, mən
Siniflər döyüşündən törənən
bir əsgər kimi,
Şeirlərimi şüarlara döndərirəm.
Onları son döyüşün
ilk cəbhəsinə göndərirəm.

*1931*

## QIZIL ŞƏRQ

İnlədi Şərq,
inlədi...
Tunc əsrlərin dəmir çəngəlində.
Çiyni zər paqonlu şahların,
"gözə görünməyən allahların"
əlində
inlədi Şərq.
Suların səsində matəm
və göz yaşı dinlədi Şərq...
Utanmadı,
Böyük Britaniya lordları
utanmadı.
Boynu zəncirli
və kirli
Şərqin
"halına yanmadı".
Odlara diri-diri qalandı Şərq.
Dönə-dönə parçalandı Şərq –
Altay,
Tibet,
Himalay,
alay-alay
o dağlar
üzünü günəşə göstərmədi.
Üyləri* qabar tutan əllər
əyilib öz gülünü dərmədi...
Bunu görməyən.
İdealist əmələlər
rənglədi maskasını,
Günü-gündən,
həmən
açdı Şərq
qollarını
dərin

---
* Barmaqların bükükləri

və dibsiz göylərin
"mələkli" boşluğuna,
"tanrının" sərxoşluğuna.
Budur
Şərqin ciyərlərini gəzən
və onu bəzən
öldürən ilk azar,
Bunun uzun tarixi var,
Heyhat!..
Ağarıb saçları, qocaldıqca
gəncləşir həyat.
Gördü Günəş,
gördü Ay
ki, doldu tay-tay
Kitayın ipək malı
Parisin şantanlarına;
Ümidim özgədir yarına.
Qoy
Yaxın gələcəyi görsün
və get-gedə hirsindən ölsün!
Gecələr qayıq gəzintisinə çıxan
Yanaqları boyalı London xanımları
Bilsinlər ki, Şərqin varı
Boşalmayacaq Avropanın limanlarına.
Ümidim özgədir yarına.
Çoxaldı bax,
çoxaldı!
Hər üsyana səbəb olan
böhran
yenə çoxaldı.
İşçilər işsiz qaldı,
Çoxaldı
qarnı açıq və yurdsuz
yavruların sayı.
Doldu dar keçidli sokaklara*
üsyançıların alayı.

---
* Küçələrə

Trak...
Trak...
Tra... raq...
Divarları yırtaraq
"Gəlin!
Gəlin!" – dedilər.
və hər
gücünə güvənən
düşmənə hücum başladı.
İrilər sarıldı silaha,
körpələr daşladı...
Yazıq!
Kəsdi yolumuzu yenə
faşizmin atlı dəstəsi,
İşlədi gecənin dərinliyinə
topların səsi,
Demək,
Düşmən hələ qüvvəlidir.
Ona bəzən
kömək edən
"işçilərin" öz əlidir.
Aha!..
Az qaldı sabaha,
ağarır dan yeri;
Cəbhədə sağ qalanlar
dönməsin geri,
ağarır dan yeri...

*1931*

## PAMBIQÇILAR

Günün saçaqları yayılır düzə,
Çünki təslim olur gecə gündüzə.
Könül xumarlanır duyduqca dərin,
Üfüqlər ləkəsiz, havalar sərin;
İndi son bahardır, gəlib keçdi yay,
Göydə təkər kimi yuvarlanır ay.
Çöldə traktorun səsi canlanır,
Obalar şənlənir, həyəcanlanır.
Səslənir yamaclar, dağlar, dərələr,
İnsanı güldürür bu mənzərələr.
Oğru qarğalara tüfəng atılır,
Qocalmış torpağa dərman qatılır.
O biri yanda da bir böyük dəstə,
Dillərdə bayatı, kəsmə şikəstə
Arxın kənarında pambıq dərirlər.
Dalda qalanlara yol göstərirlər.
Biləklər çirməkli, döşlər önlüklü,
Hamısı torbalı, hamısı yüklü,
Tökür alınları puçur-puçur tər.
Birisi yorulub deyir ki, – yetər,
Gəlin nəfəs alaq, bir az dayanaq,
Günün qabağında bir az da yanaq.
Soyusun tərimiz, sonra başlayaq,
Artıq dərənləri çox alqışlayaq.
Olmaz! Olmaz! – deyir komsomol Pəri, –
Bir şey yığmamışıq gələndən bəri,
Nə tez yoruldunuz? Qoyun iş görək!
Eyvaz bir asqırıb, bir öskürərək:
Çox sağ ol, ay qızım, yamanca şeysən,
Halaldır donunu qızıldan geysən;
Yaraşır adına komsomolkalıq.
Qarışdı, səsləndi birdən aralıq
Yaşasın zərbəçi komsomol Pəri!

Bu hal düşündürdü tənbəl Əskəri;
Başını qaldırıb yerindən qalxdı,
Təzədən döşünə– bir önlük taxdı
Qarışdı dəstəyə, qarışdı işə,
Dostlar sevinəcək belə gedişə.

Gəldi günorta çağı,
Gün qızarıb yanırdı.
Azca külək də vardı,
Otlar dalğalanırdı.
Zərbəçilər gəldilər
Arxın kənarlarına: –
Azarlarıq, – dedilər, –
İşləsək ac qarına.
Şirin söhbət içində,
Çoxları bir biçimdə,
İştahlanıb yeyirlər;
Qızlar mahnı deyirlər.
Yetmək üçün murada
Xumar baxır Murada;
O da bilib əhvalı
Oynadır qaş-gözünü,
Bir az çəkir özünü...
Hamı duyub bu halı,
Gülüb qaqqıldaşdılar,
Köpüklənib daşdılar.

Uzun boylu, ala gözlü dağ gövdəli birisi,
Odur kolxoz gənclərinin danışıqdan dirisi,
Pəhləvandır bu qəhrəman, zərbəçidir öz adı,
İçlərindən baş qaldırıb şahin kimi sıçradı:
– Bu gün işə çıxmayanlar, dünənkindən daha çox...
Elə tənbəl insanların cərgəmizdə yeri yox.
Əsmər qarı süməklənir kulakların yanında,
Eloğlu da nağıl deyir xanlığın eyvanında.

Qasım kişi dünən gecə qoşub ulaqlarını,
Ortaq olub Məcid bəyə – gedib odun satmağa.
Gərək tutub yaxşı çəkək onun qulaqlarını,
Bir də cürət eləməsin kolxozu aldatmağa.
Gülpəri də dalaşmışdır! ərilə, birdən-birə
Acığından gövdəsini qaldırıb çırpmış yerə;
Deyirlər ki, bərk naxoşdur yazıq, uşaq salmışdır,
A yoldaşlar, yenilikdə köhnəlik çox qalmışdır.
Xanpaşa da dünən gecə işdən çıxıb gedəndə
Tərli-tərli su içmişdir, qanı donmuş bədəndə.
Gərək bütün burdakılar bir əl kimi çalışaq,
Çətinliyin hər qeydinə, hər dərdinə alışaq.
Qüvvə bizim, motor bizim, torpaq bizim, su bizim.
Öz əlimiz qursun gərək bu yurdda sosializm.

Yedilər, içdilər qəhrəmanlarım,
Üstünə od kimi düşdülər işin.
Mənim də qəlbimdə coşdu qanlarım,
Çünki yolçusuyam mən bu gedişin.

*1931*

## TİKANLI SÖZLƏR

Mən yazmamış bilirəm
və sevinib gülürəm
ki,
xoşuna gəlməyəcək.
bu şerim.
Yanaqlarına
tək xal qoyanların;
Bu dünyada
nə mənsəbdən
nə şöhrətdən
doyanların.
Çünki mən
nə gülləri, çiçəkləri sayrışan
tər cunalı yazların,
nə sarı simləri
sarılıq gətirən
ağ sədəfli sazların,
nə də ki,
zurnalı düyünlər şairiyəm.
Mən
günəşi yarışa çağıran
böyük günlər şairiyəm...
Yox deyil bizim kəndlərdə
ətəyinin altında rüşvət alanlar.
Yuxulu,
yorğun
şikayətçiləri
get-gələ salanlar;
Açılır örtülü pərdə...
Sənriyə-sənriyə
piyləndikcə
göbəklərindəki qatlar,
Dərisinə sığmayan bürokratlar
Yox deyil kəndlərdə;

Açılır örtülü pərdə...
Əgər
etmirəmsə səhv,
Onlar olur
gah “firqəvi”,
gah bitərəf;
Hər ikisi birdir,
onlar əlbirdir.
Budur, bax
müxbirin yazdığı kağıza,
Dolaşır ağızdan-ağıza:
Tanıyın Salyanda
Yıxılıb küp dibində yatan
və hökumət atlarını
yarı qiymətinə satan
köhnə çovdar Şirəlini.
Qırmızıları
güllələdiyi zaman
aparmışdı top əlini.
O, Tiflisdə
Qızıl verib sağaltmışdı topalını...
Tanıyın Qazaxda
Gündüzləri
birliyin hesabına yaşayan,
Gecələri
banditlərə
güllə daşıyan
O yöndəmsiz Qulunu;
Pirinə təpik atan
kəndin o yoxsulunu.
Tanıyın Gəncədə
Həftəsi tamam olmamış
kənddən şəhərə qaçan
bir gənc müəlliməni;
heç açmadı bu məni...
Söylə şəhər,

neçə nəfər
divarlarının arasında
gizlənənlər var?!
Səsini kəndlərdə qeyb edənlərdən,
Söylə, şəhər,
neçə nəfər?
                    İnanıram sənə mən!
Edilən cinayətlərin
                                  adını
tut onlardan xəbər al!
Küçələrə məni də sal,
Örtülü düşmən
daha qorxuludur.

*1931*

## ŞEİR VƏ XALTURA

“Kəndə, kəndə və kəndə
    və yenə də kəndə!”
Belə yazdı bəziləri
Şerin başında turp əkəndə.
Sevmədim
Qurama sözlərin
        cansız hərəkətini,
və beynimə
zorla
    pərçimlənən
    bu sözlərin ləzzətini...
Sevmədim
imzasını görünmək üçün atan,
Qəlbi şablon
    və şarlatan
şairlərin
    yerində şıllaq atmasını;
Sevmədim
    onların sənət adına
    xaltura yaratmasını.
Qoy
    oxucu gözlərinə
        gözlük taxsın
və bu “şeir” adını daşıyan
        sözlərə bir də baxsın:
“Kəndə, kəndə və kəndə
və yenə kəndə!”
Məncə bu “şeir”
açıqca deyir:
İçəriyə pəncərələrdən
        göz atanların
Görüb yaşamadığı
        Həyat səhnəsini

və qəlbini pula satanların
Ən aciz səsini...
Daloy
qəlbini proletarın
qəlbi
kimi
duymayan
və şeirdə
şerilik izi qoymayan
bu qafiyəli dəllallar!
Sənətin bazarına sürülməsin
bu saxta mallar!

*1931*

* * *

Keçdi günlər ki, sənin hüsnünə pərvanə kimi
Gərərək köksümü yandım uca eşqimlə həmən;
İndi sənsiz gəzirəm çölləri divanə kimi,
Çıxıram böyləcə bəzən o xəyal dağına mən.

Baxıram, keçdiyimiz yollara bir-bir baxıram,
O keçənlər hələ sövq etmədə röyaya məni...
Mən, zarafat deyil, ey sevdiciyim, can yakıram...
Sənsən, əlbət, düşürən bu qara sevdaya məni.

*1931*

* * *

Sən o deyilsən, ah!.. Dəyişdin, döndün,
Buludlar qoynunda parladın, söndün?!
Söndün mənim ruhum, amalım kimi,
Artıq, xəyal olan xəyalım kimi.

Nerdə, bir söylə, ah, nerdə o camal?
Nə tez xarab oldun? Söylə, bu nə hal?
Yararmı nazənin, incə bir çiçək
Böylə iyrənc olsun...Yaramaz gerçək!

Yaramaz şu boya, şu qırmızı rəng,
İştə dodaqların nə diyor mələk?
Nədir o sünilik, nədir ah, aman!
Mən buna vicdanən ağladım, inan!

Bir zaman dağlarda vəhşi lalə tək,
Nə qədər gözəldin...Gülümsəyərək;
O zaman mənim bu şikəstə ruhum,
Bu darğın xəyalım, qəlbi-məcruhum
Və bütün varlığım bir kölgə kimi
Qoşardı arxanca yorulmadan,ah!..
Həyat amansızdır...səndə nə günah?!
Uydun böyüklərə, şana, şöhrətə,
Uydun hər keçici eyşü-işrətə.
Unutdun hər zövqü, qəlbi, vicdanı,
Aradın bir şöhrətpərəst insanı.
Sonra min rəng aldın və sürtdün boya,
Kəndini sevdirmək istədin ona...
Heyhat! Səni görcək iyrəndim bəlkə,
Nədir üzündəki o çirkin ləkə?
Sil! Sil onu, artıq görməyim bir də,
Mən dözə bilmərəm bu sonsuz dərdə,
İştə bax, nədənsə...nədənsə bilməm
Mən yazmaq istərkən, qırıldı qələm...

*1931*

## ROT FRONT

Gözlərim sancılarkən bu bayrağın rənginə,
İçimdə dalğalardan gurultu qopdu yenə...
Bu bayraq ki, üfüqsüz dənizlərdən keçərək
Tutuldu güllələrə qızıl qanlar içərək;
Şrapnellər ötürkən sağından və solundan,
Bir çox döyüşdən çıxdı, qayıtmadı yolundan.
O dolaşdı Berlinin sokaklarında* bəzən,
Havasında bir ölüm, bir də ayrılıq gəzən
Gecələrin qoynunda dalğalandı bu bayraq.
Şerim inandırmasa, gəl onun rənginə bax!
O bayraq ki, rəngi qan, varlığı, qəlbi qandır,
Milyonların əlində bir yenilməz qalxandır.
Mənsəb dalınca deyil, haqq axtarır dünyada,
Ağ saçlı keçmişləri salsan bir az da yada
Haq verərsən sözümə;
Ki yer üzü,
Sözün düzü,
İki düşmən cəbhədən görünmədə gözümə,
Haq veriniz sözümə.
Bu bayraqdan oxudum sahildəki qanları,
Sayıb sona yetmədim günahsız qurbanları.
Bu bayraqda canlanır bir son aclıq dünyası,
Qızlığında dul qalan insanların röyası.
Fahişəlik, yazıqlıq, sonra bilməm ki, nələr...
Yol üstündə titrəyən ağ saqqallı çənələr;
"İnsaf edin! Əl açın! Mən işsizəm" sözləri,
Ağlamaqdan kor olan bir ananın gözləri;
Cəbhələrdən qayıtmış, tək qollu qəhrəmanlar,
Kitablara düşməmiş qanlı, qorxunc zamanlar,
Hisli, nəmli, qaranlıq podvallarda yaşayan,
Ömrün ağırlığını öz çiynində daşıyan,
İşçilərin adından bir elçidir bu bayraq,
Şerim inandırmasa, gəl onun rənginə bax!

---

* Küçələrində

Bu bayraq ki üfüqsüz dənizlərdən keçərək,
Tutuldu güllələrə qızıl qanlar içərək;
O gərdi öz köksünü bombaların səsinə,
Gəlib çıxdı nəhayət Şuralar ölkəsinə.
Bizim bu qızıl Bakı aldı onu qoynuna,
Qardaşlıq əllərilə sarılırkən boynuna
Bu qırılmaz peymanı uzaqlardan gördülər,
Avropanın, asyanın köpəkləri hürdülər.
İndi bu bayraq gəzir əldən-ələ, dolanır,
Mil düzünün, Muğanın pambıqları sulanır.

Yarış gedir Şəkidə
Lənkəranda, Ləkidə
Qazax, Gəncə, Qarabağ,
Bir çox dərə, bir çox dağ
İndi durub üz-üzə,
Gecə dönür gündüzə.
Günlər keçir axaraq.
Veriləcək bu bayraq
Birincilik qazanan
İnsanlara şübhəsiz,
Bilirsiniz bunu siz.

O bayraq ki, üfüqsüz dənizlərdən keçərək,
Tutuldu güllələrə qızıl qanlar içərək.
Şrapnellər ötürkən sağından və solundan,
Bir çox döyüşdən çıxdı, qayıtmadı yolundan.
Üstündəki o yumruq üsyanın simvoludur,
Bir üsyan ki, tarixdə qurtuluşun yoludur.
Ordusunu çəkirkən yazdı genosse[*] Telman,
Halqalı zəncirlərin qırıldığı bir zaman:
Berlinin kəlləsində sancılacaq bu bayraq,
Şerim inandırmasa, gəl onun rənginə bax!

*1932*

---
[*] Yoldaş

## SALAM

Anam qoca,
              ömrü yarı,
Axıtdığı göz yaşları
Atama bir cavabdır.
Əsrlərdən qadın üçün
Ağlamaq bir savabdır...
Bişir, düşür, yama, dara;
Günün qara, gecən qara.
Get dalında yetim gəzdir,
Döşlərindən süd əmizdir.
Ac qalsan da il uzunu,
Sənə layiq gördü bunu
Məhəmmədin şəriəti.
Çünki adın
Oldu qadın.
Sillə, yumruq, qamçı, zopa,
Haqq bağıran nəfəsindən
Qışqırıqlar qopa-qopa
Bu dünyada nələr çəkdin!..
Nə gül dərdin, nə gül əkdin;
Sən qaranlıq bucaqlarda
Gün görmədin əzəlləri,
O dərdindən danışmadı
Vaqiflərin gözəlləri.
Sirri dərin
              əsrlərin
Pəncəsində çox zarıdın.
Nə gün gördün,
                            nə yarıdın...
Salam sənə, işçi qadın!
Dəyişmişdir bu gün adın.
Boynundakı o halqalı
Zəncirləri atırsan,
Artıq bu gün yeni-yeni
Məqsədlərə çatırsan.

Bildim, səni Oktyabr yaratdı,
İnsanlığın günü-gündən
Çiçəklənib boy atdı.
Salam sənə, azad qadın!
Dəyişmişdir bu gün adın.
Sən bizimlə yol yoldaşı...
Səninlədir bu həyat,
Səni oğul və ər kimi
Salamladım iki qat!

*1932*

## AŞIĞIN DƏRDİ

Mən səni görmüşəm on beş il əvvəl,
Dilində bir qoşma, bir dərdli qəzəl,
Çadırdan çadıra qonaq gəzərdin.
Yazıq! Duyulmadı sənin də dərdin,
Sənin də göz yaşın sellərə döndü,
Qaranlıq yollarda çırağın söndü;
Sənin də bağrını nizələr dəldi,
Buludlar qarşında salama gəldi.
Sənin də yar deyib gözlədiyin qız
Satıldı... şahlara dolandın yalnız.
Bağladın meylini telli bir saza –
O sarı simlərə söz yaza-yaza,
Keçdikcə dağlardan, göy dərələrdən,
Bir də ürək açan mənzərələrdən,
Dərd alıb, dərd yedin illər uzunu,
Bir soran olmadı kim gördü bunu?

* * *

Dilsiz qayalara dil deyib durdun
Sənin bu dərdini dinlədi yurdun,
Tapdandı gəncliyin, şərəfin, adın;
Qamçılar altında sındı qanadın,
Elin şikayəti ötdü səsində.
Bəzən də bəylərin toy məclisində
Dedin Koroğludan, Leyli-Məcnundan,
Yoxsula bir xeyir çıxmadı bundan.
Odlara bir yanıb, bir də qalandın,
Ağır ellər kimi sən də talandın ...

* * *

Ay da taleyinə uzaqdan baxdı,
Çaldığın havalar yandırıb yaxdı
Yaslı gəlinləri, yaslı qızları,
Ahından əridi dağların qarı.

Söylədi nalənin başqa hüsnü var, –
Bəzi “şeir” yazan “nazik adamlar”...
Onlara xoş gəldi, nədənsə, aşıq,
Səssiz üfüqlərdə sönən hər işıq!..

* * *

Sən ömrün uzunu çəkildin dara
Baxıb şeir dedin göy yaylaqlara;
Ağladı dərdinlə güllər, çiçəklər;
Dumanlı dağlardan əsən küləklər
Qurtuluş günündən vermədi müjdə,
Haqqı söylədilər, hər zaman üzdə...
Bükdü qamətini ahlar, amanlar,
Göylərə sığmayan ağır zamanlar,
Adına insanlar – məcnundur – dedi.
Yoxsullar qazanıb, varlılar yedi.
Bağladın meylini telli bir saza –
O zərif simlərə söz yaza-yaza
Obalar dolaşıb, oymaqlar aşdın,
Sonsuz üfüqlərə hər gün yol açdın.

* * *

Yaxşı yadımdadır, bir yaz gecəsi
Bir toy məclisində sən oxuyurdun.
Dinib-danışdıqca sazının səsi,
Ortada qışqırıb bir xal da vurdun,
O toy məclisində sən oxuyurdun...
Axşamdan bir uzun nağıl başladın,
Qurtardı söhbətin gecə yarısı.
Köhlən igidləri çox alqışladın,
Məclisin gəlini, qızı, qarısı
Üzünə boylanıb baxdılar mat-mat,
Bir deyən olmadı: “Yoruldun, get yat”...

O gəzdiyin dağların qoynuna gün doğalı,
Bir ömürlük sitəmdən insan azad olalı,
Sənin də rəngində, bax
Günəş doğmadan qabaq
Bir qızartı parladı;
Onun – həyatdır adı...
Öz alnının tərindən,
Sinənin dəftərindən
Söz qoşursan qəhrəman insanların adına,
Yaşmağını götürüb iclas açan qadına;
Qışda, yazda və yayda
Hər həftədə, hər ayda
Bizim kolxoz kəndlərinin konsertinə gedirsən,
Şabaş deyib qışqıran toyları tərk edirsən,
Sən bu yeni dünyadan baxıb ilham alırsan,
Olub keçən hər şeyi öz sazında çalırsan;
Bəzən də radioda dalğalandıqca səsin,
Bilirəm ki, yaşamaq, çalışmaqdır həvəsin.
Mən demirəm büsbütün dəyişmişdir varlığın,
Canından çıxmamışdır köhnə tamahkarlığın.

* * *

Sən yenə vaxt tapıb hey soxulursan
Kirli çayçıların küncünə sarı;
Hər gələn yolçuya həmdəm olursan.
O tərlan könlünün, şahin vüqarı
Beş quruş uğrunda, bəzən alçalır,
Özün də bilmirsən əlin nə çalır.
Bazar başlarında soğan satanlar,
Oğrular, əyrilər, o şarlatanlar
Toplanıb başına: “sağ ol!” – deyirlər.
Nuhun gəmisindən qalma şeirlər,
Onlara dad verir xurmalar kimi,
Soyuq məzarlarda həyat var kimi...

* * *

Sən ey varlığında sənət yaşayan,
O sarı simlərin ustası yoldaş!
Əgər mənliyini sevməsə insan,
Onun bu dünyada mənası bir daş...
Bəlkə də bir tozdur... onu küləklər
İstədiyi səmtə alıb sürüklər.
Ölüb gedənlərin yasını burax,
Anla ki, hər zaman axır bu həyat
Daşqın sular kimi, gəncliyə bir bax!
Fikrində, hissində inqilab yarat,
Anla ki, hər zaman axır bu həyat!

*1932*

## YOLDAŞ KOMANDAN

Bu gün dünya boyu bir axın var ki,
İnsanlar ayrılmış iki cəbhəyə .
Avropa, meydanın o qədər dar ki,
Ömrün tükənəcək "vay" deyə-deyə

Bilirik, tülküdən daha qurnazsan*,
Dilində "qardaşlıq", əlində silah;
Yüz barışdırıcı kitab da yazsan,
Tutqun üfüqlərdə açılmaz sabah.

Bəsdir aldatdığın tarix boyunca
İşləyib, yorulub ac yatanları;
Yalan vədləri gördük doyunca,
Gördük o gizlindən ox atanları...

Sübutmu? Kitayın bugünkü halı,
Yerindən danışan bədənsiz başlar...
Qayalar qoynunda qəlbi yaralı,
Zəhərdən gicəlib gülən qardaşlar...

Biz az döyüşmədik, qoca dünyada,
Qorxub çəkinmədik isti qanlardan.
Atımız öluncə, getdik piyada,
Çıxdıq o qarışıq imtahanlardan.

Sibir düzlərində, Türkmən çölündə
Açıldı qolların dəmir bağları.
Nevada, Volqada, Baykal gölündə,
Sahillər boyunca qovduq ağları.

Şerim olacaqdır iti süngülər
Sinəmi səngərə verdiyim zaman.
O gün cəbhədəki hər qızıl əsgər
Səsləyəcək məni – "Yoldaş komandan!"

*1932*

---

* Hiyləgər

## XAVƏR ÜÇÜN

Karanlıklar çökürkən pəncərəmdə hər axşam,
Parlar, gülər ruhimə gözlərində yanan şam.
O şam ki, bir günəşdən daha parlak işıldar.
Onda şair qəlbinin başqa bir arzusu var...
Həyat, ölüm, səadət,
Göz yaşları, fəlakət.
Bütün bunlar canlanır xəyalımın önündə,
Və ömrümün bəxtiyar olacağı bir gündə.
Mən sənə bağlıyam bax!
Səni görməzdən qabaq.
Bu dünyada başımdan nələr keçdi, gözəlim,
Gəl unutdur dərdimi, gəl bərabər gəzəlim.
İyrənmişəm həyatın başı soyuqluğundan,
Yorğunam sevdiciyim nəşə, kef yoxluğundan
Gəl avla könlümü sən, inanmışam sözünə,
Bəzən sadə və yoxsul görünsəm də gözünə.
Bəni əfv et eşq üçün, bütün bunlar düzələr,
İki gəncin payına yalnız səadət gələr.

*1932, fevral*

## SEVGİLİM XAVƏRƏ!

Sınamışam dönə-dönə bu dünyada baxtımı,
Heç ömrümdə mənə karşı doğru bir göz baxdımı?
Əgər sən də vəfasızlıq və xəyanət göstərsən,
Olacaqsan gözlərimdə qiymətsiz pul kimi sən.
Açıq danış, açıq boylan örtülü pərdələrdən,
Şübhə doğar, çox görmüşəm insanlarda bunu mən.
Yaraşırmı sənə, Xavər, ikiüzlü yaşamak?
Sonra məni uçurarsan... bir aya bak, günə bak.
Ləkəsiz ol onlar kimi, bu yaraşır adına,
Vəfasızlıq və xəyanət səfalətdir kadına.
Varsın, məni okşamasın gözəllərin kılığı
Neyləyirəm bir aşkı ki, onun var ayrılığı?
Gülür günəş, gülür həyat, bu gülüşdə həyat var,
Sənin görə bilmədiyin özgə bir kainat var.
Uçurumlar, kayalıklar korkutmayır kəlbimi,
Dayanmışam dənizlərdə, dalğalarda dağ kimi.
Tufan kopsun, yellər əssin, oynamaram yerimdən,
Poladlardan kurulmuşam, əyilməm insana mən.

*1932*

## BAHAR

Mən səni gördükcə gözlərim yanır,
Sən ey gəncliyimin güzgüsü bahar!
Uçan buludların bəzən dayanır,
Yoxsa söyləyəcək bir sözünmü var?
Sən ey gəncliyimin güzgüsü bahar!

Özün bilirsən ki, xeyli zamandır
Çiçəkli düzlərə qanad gərmədim.
Kim deyər gəncliyim haman, hamandır –
Mən keçən günlərə yol göstərmədim;
Çiçəkli düzlərə qanad gərmədim.

Bahar! Gəl demə ki, qanım soyuqdur,
Mənim də qəlbimdə əməllərim var...
Kim deyir, sevginin mənası yoxdur?
Gözlə, qırılmasın ortada ilqar,
Mənim də qəlbimdə əməllərim var...

Qoy deyim onları, eşit, sən də bil;
Bil ki, hər əməlim bir kainatdır.
Səsimə səs versin bağçada bülbül;
Cahanda ən gözəl, məncə, həyatdır,
Bil ki, hər əməlim bir kainatdır...

*1932*

## KOMSOMOL MARŞI

Bir yeni qüvvətlə sıçradıqca sən
Baxır qüdrətinə sevinir Vətən.
Dağlar da səslənir, daşlar da birdən:
Hücuma tanklarla keçir komsomol,
Təbiət, təslim ol! Düşmən, təslim ol!

Qorxub çəkinmədik ölümdən, qandan,
Çıxdıq illər boyu çox imtahandan,
Dağı dağ üstünə qaldırır insan.
Hücuma tanklarla keçir komsomol,
Bir-iki, bir-iki, bir-iki... Sol! Sol!

Dalğalan, bayrağım, qayna, dalğalan!
İgidlər qanıdır rəngindəki qan...
Sabahın qoynunda borular çalan
Hücuma tanklarla keçir komsomol,
Təbiət təslim ol! Düşmən, təslim ol!

Kimdir addımını sağdan atanlar?
Yürüş ahəngini pozub qatanlar?
Yerlərin göylərə işarəsi var:
Hücuma tanklarla keçir komsomol,
Bir-iki, bir-iki... bir-iki... Sol! Sol!

Atın güllələri, yayılsın göyə.
Azğın ürəklərə budur hədiyyə!
Dünyada qan izi kəsilsin deyə
Hücuma tanklarla keçir komsomol,
Təbiət, təslim ol! Düşmən, təslim ol!

*1932*

## CİNAYƏT

Səbəbsiz deyildir nə ölüm, nə qan,
Nə sevda, fırtına, nə dağda duman;
Bütün fəlakəti yaradır "insan",
Mən bu həqiqəti səndən öyrəndim.

Bəlkə sayıqladan məni azardır,
Başıma gen dünya yenə də dardır.
İçimdə gizli bir "cinayət" vardır...
Nə qədər alçalıb, nə qədər endim,
Mən bu həqiqəti səndən öyrəndim.

Parçalan, ey qəlbim! Bir dəfə sökül!
Xəstə yarpaq kimi ovxalan, tökül!
Bəlkə zədələndi o dərdiyim gül...
Artıq öz-özümə baxıb iyrəndim,
Mən bu həqiqəti səndən öyrəndim.

*1933, 7 oktyabr*

## BİZİM BAYRAM

Hər il bu bayramın adı gələndə
Al geyib bəzənir bizim Vətən də.
O gün izdihama qarışıb mən də
Qəlbimin qanıyla şeir yazıram,
Bu şərəfli günə mən də hazıram.

Bir gün silahlandı işçinin əli,
Yıxıldı dünyanın əski təməli.
Alıb dalğalara beynəlmiləli,
Sahillər boyunca oxudu Neva,
Yerin qüvvətindən titrədi hava.

Sibir çöllərində zəncir səsləri
Lal olub, ötmədi o gündən bəri;
Lenin – inqilabın böyük rəhbəri
Söylədi əmr ilə “bu gün” sözünü,
Zaman ayırmadı bizdən özünü.

O vaxtdan bəriyə onaltı ildir,
Dünya o əvvəlki dünya deyildir.
Mənim sözlərimi cahana bildir:
Yurdumun bu əziz, şanlı günündə
Qızarsın od kimi, rəngi günün də!

Kimdir əbasının altda ağlayan,
Yaslı gəlin kimi qara bağlayan?
Görsün, sular kimi coşub çağlayan
Bu qızıl bayraqlı gənc nəslimizi,
Dənizlər arxası tanısın bizi...

Bu əsgər, bu yürüş, bu hündürboy at,
Bu üstü yazılı rəngli plakat,
Bu daşqın həyəcan, bu qaynar həyat
İnsanın fikrini alıb gəzdirir,
Hər biri şeirdir sayılsa bir-bir.

Bir su kənarında şəhərdən uzaq
Dağların qoynunda o şənliyə bax!
Kolxozçu yoldaşlar günəşdən qabaq
Durub qarşılayır bu böyük günü,
Aşıqlar da çalır öz gördüyünü.

Könül havalanıb gəzir dağları,
Sinəmdən getməyir elin ilqarı.
Bir də o yerləri görsəydim barı
Deyərdim onlara şerimi özüm,
Onda yaşarardı şadlıqdan gözüm.

Deyirlər bu ilin məhsulu çoxdur;
O gördüyüm kənddə dilənçi yoxdur;
Əlimiz işdədir, gözümüz toxdur.
Bu xəbər ölkəmin zəfər səsidir,
Bu şanlı bayramın hədiyyəsidir.

Yenə də qışqırır yoldaş Lökbatan,
Bütün torpağında, daşında fantan;
Günəşə yüksələn, ulduza qalxan
Sağlam insanların intuziazmı
Dağlardan alçaqmı, sulardan azmı?

Bu hal düşündürür qarı düşmanı,
Başına sıçrayır qəlbinin qanı;
Qoy külə döndərsin gendən baxanı
Ətəkli çöllərdə ağaran dəniz;
O canlı sənəti görə bilsəniz!..

*1933*

## SEVGİ

Yenə də ruhumu gəzdi bir duyğu...
Götür albomunu, mən deyim, sən yaz!
Bizim dünyamızda günah deyil bu –
Səninlə üz-üzə danışsaq bir az.
Götür albomunu, mən deyim, sən yaz!

Gecələr yalnızam mən yatağımda,
Bilirəm yalnızsan hələlik sən də.
Xəyalım dağılır yellər əsəndə,
Dalıb düşünürkən öz otağımda,
Gecələr yalnızam mən yatağımda.

Söylə, təbiətə uyğunmu, səncə
Keçdiyim yollarda qalmasın bir iz?..
Özünü anlayıb, duyan bir gəncə
Gülüncdür bu başısoyuqluq şəksiz;
Keçdiyim yollarda qalmasın bir iz?..

Bax, məni incidir, ağrıdır bəzən
Hər axşam bir evdə qonaq qalmağım:
Rəngində ölümün kölgəsi gəzən
Şübhəli qızlardan adres almağım;
Hər axşam bir evdə qonaq qalmağım...

Bağışla, sevgilim, açıq söylədim!
Gizli nöqtələrə əl aparma sən.
Sorma o qızları, sorma neylədim.
Həyatın iç üzü örtünür bəzən.
Gizli nöqtələrə əl aparma sən...

*1933*

## SEVİRƏM

Mən də bir insanam, mən də canlıyam,
Mənim də qəlbimin arzuları var.
Deyirlər arabir dəliqanlıyam.
Çox da deyinməsin dalımca əğyar!
Mənim də qəlbimin arzuları var...

Mən səni sevmədim “o gözlər” deyə,
Gözümdən od kimi yaşlar tökmədim.
Mən sənə vermədim qızıl hədiyyə,
Çünki yalvarmadım və diz çökmədim;
Gözümdən od kimi yaşlar tökmədim.

Sən Xumar deyilsən, mən də ki, Sənan,
Bugünkü sevginin başqadır andı.
Nə Məcnun, nə Leyli, nə də biyaban
Qalmamış, onların adı yaşandı;
Bu günkü sevginin başqadır andı.

Qoy bizə gülməsin nə dost, nə də yad,
Ehtiyatlı danış, ehtiyatlı dur!..
Nə qədər mən sağam, get dolan azad!
Fəqət sevgilimdən xahişim budur:
Ehtiyatlı danış! Ehtiyatlı dur!..

Haydı, insanlara qaynayıb qarış
Qalma bu dünyada həyatdan iraq!
İstəsən aləmi gəz qarış-qarış,
Xain adamları tez görüb buraq,
Qalma bu dünyada həyatdan iraq!

Hüsnünü örtməsin nə pərdə, nə rəng –
Ay kimi saf dolan, gün kimi açıq.
Keçmişin üstünə qələm çəkərək,
Vuruş meydanında vuruşmağa çıx,
Ay kimi saf dolan, gün kimi açıq!

Bu son sözlərimi qulağından as!
Dünyada, hər günün bir hökmü vardır.
Vaxtını almasın nə toy, nə də yas,
Gurlayan səsinlə "irəli!" hayqır;
Dünyada hər günün bir hökmü vardır.

*1933*

## BƏZƏK VƏ ZİNƏT

Deyirlər arabir arxamca baxıb
Sadə geyimimdən gileylənirsən.
Bəzən də yuxudan yarımçıq qalxıb,
Titrəyib, döyünən o qəlbinlə sən
Sadə geyimimdən gileylənirsən.

Ömrümün ən yoxsul zamanlarından
Məndə bu sadəlik bir adət olmuş.
Başqadır güzəran, başqadır insan.
Könlüm azad gəzən havalı bir quş –
Məndə bu sadəlik bir adət olmuş.

Bir də sevgilimi aldatmaq üçün
Dəyişib cildimi başqalaşmadım.
Böyük bir hünərim yoxsa da bu gün,
Necə olsa, yenə şairdir adım;
Dəyişib cildimi başqalaşmadım.

Səndən əvvəlkilər uymuş zinətə,
Yaşamış dünyada simuzər üçün.
Nə qəlbə yanmışdır, nə məhəbbətə...
Qadın böyüdülmüş yalnız ər üçün;
Yaşamış dünyada simuzər üçün.

Hər daşı qaldırıb altına baxsan,
Ordan unudulmuş bir nalə gəlir...
(Sən həyata görə hələ uşaqsan)
Dünyada hər nə ki, xəyala gəlir –
Ordan unudulmuş bir nalə gəlir!..

*1933*

## ANAMIN DƏRDİ

Bəzən o insanı düşündükcə mən,
Titrədir canımı dağlar ruzgarı;
Köklü ağac kimi qopub yerimdən,
Uçuram bir dərin boşluğa sarı,
Titrədir canımı dağlar ruzgarı.

O gözəl xilqətin nəydi vərdişi? –
Beşik yırğalayıb, paltar yamamaq;
Onun belindəydi evin hər işi.
Anamı səslərdi günəşdən qabaq.
Beşik yırğalayıb, paltar yamamaq.

Atam yuxulardı tər tökə-tökə,
Günəş qurşağına qalxana kimi;
Onun qarşısında diz çökə-çökə
Anam çalışardı, bir ana kimi;
Günəş qurşağına qalxana kimi.

Sonra da dərindən nəfəs alaraq,
Şikayət eylərdi öz taleyindən;
Qızlıq günlərini yada salaraq
Həyata, hər şeyə küsərdi bəzən,
Şikayət eylərdi öz taleyindən;

Atam acıqlanıb döyəndə onu,
Durub boylanardı qara qul kimi;
Vaxtına çatmadı ömrünün sonu.
Qaranlıq üstündə qaraul kimi,
Durub boylanardı qara qul kimi.

Anamın gözləri baxtından qara...
Bəzən buludlara baxıb dalardı.
Dərdini söyləyib qarlı dağlara.
Qəlbini saz kimi tutub çalardı.

* * *

Bir sabah anamın belində sənək,
Yolda gah üşüyüb, gah əsnəyərək,
Dönüb qayıdanda bulaq başından,
Yolda söz atmışdı ona bir cavan:
“Bir dayan, ay gedən, de haralısan?
De hansı,dağların tək maralısan?”
Anam bu səsdəki hissi-hörmətə,
Təmiz şairanə bir məhəbbətə
Cavab verməyərək evə tələsmiş,
Vücudu yel kimi titrəyib əsmiş.
Sonra da atamı tutaraq dilə,
Açmış əhvalatı o gülə-gülə.
“İnək göz etməsə, buğa sıçramaz”, –
Deyərək, anama vurulan qapaz
Qadının başını endirmiş yerə...
O məhkum insana tutulan dirə;
Özün görürsən ki, bir faciədir...
Anla ki, sevgilim, qısqanclıq nədir?
O gündən qadının qəlbi qanadı,
Bir də açılmadı qolu-qanadı.
Qəfəsdə inləyən o yaralı quş
Açıq bilirdi ki təhqir olunmuş.
Odur ki, hər zaman ah çəkib ağlar,
Ahını dinlərdi dinləyən dağlar...
O gündən bəriyə bir gün görmədi;
Onun cavan ömrü uzun sürmədi.
Qadın bu dərd ilə içini yedi,
Bir axşam varlığa əlvida dedi.
Çökdü evimizə acı bir sükut,
Gülürdü sağlara o ölü-tabut...
O gündən dəyişdi atamın halı;
Pozuldu onun da fikri, xəyalı,
Arabir anamın yatdığı yerə
Baxıb ağlayırdı o birdən-birə
Tutduğu işlərə peşiman kimi.

Vaxtsız ayrılığa dözmədi qəlbi –
Ağardı saqqalı, saçı qar oldu,
Dərdi yetim qalmış uşaqlar oldu,
Dərdini, fikrini dağıtmaq üçün
Gedib qonşuları gəzərdi hər gün.
Gəzdiyi – məhv olmuş səadət idi.
Son təsəllisi də – ibadət idi.
Ki, tanrı əfv edə onun suçunu.
O gündən gülmədi ömrü uzunu...
Sevgilim! Anla ki, qısqanclıq nədir?
Anla ki, doğrudan o, faciədir...

*1933*

## SEVGİLİMİN QILIĞI

Gecə cansız, gecə sakit, gecə lal!
Nə qədər uçsa da uçduqca xəyal.
Udur insanı bu zülmətli gecə,
Bu vəfasız, bu rütubətli gecə.
Ay uzaqlarda, küsüb gendə durur,
Məni yelkən kimi fikrim uçurur
Döyür ətrafımı şiddətli boran,
Sevgilimdir başım üstündə duran,
Yuxusuz gözləri hərdən süzülür,
Baxıb əhvalıma candan üzülür
Və deyir: “Yazma, yazıqsan, daha yat,
Düzələn şey deyil onsuz da həyat.
Nə mürəkkəb, nə kağız qalmadı, dur,
Bu əsr şairi vaxtsız unudur...
Qapının ağzını almış qara qış,
Filosoflar belə şaşqın qalmış,
Bu həyatın dolaşıq yollarına,
Ac qalarsansa bu gündən yarına.
Bizə bir kimsə çörək verməyəcək,
Qadının “ver!”, çocuğun “ver!” deyəcək.
Nə mürəkkəb, nə kağız qalmadı, dur!
Bu əsr şairi vaxtsız unudur...”.
Xayır! Aldanma əziz arkadaşım,
Daşa dəysin də, qayıtsın da başım,
Ta ki, dünyadakı hər sirri bilim,
Uzun olsun da həyatımda dilim.
Demə sərsəm gecələr yolçusuyam,
Mən döyüşlərdə həyat ordusuyam!
Geri qalmaq – ölümün nərdivəni,
O qaranlıqlara qaytarma məni.
Sən deyirsən ki, “yazıqsan, daha yat,
Düzələn şey deyil onsuz da həyat”.
Nə sənindir, nə mənimdir bu əməl,
Özgə bir yerdə danışma bunu gəl.

Düşün, ətrafını gör, bir də düşün,
Yoxsa mənasız olur hər gülüşün,
Daha xoşbəxt edəcəksən məni sən,
Özün öz taleyini həll etsən...
Sən deyirsən ki, “yazıqsan, daha dur,
Bu əsr şairi vaxtsız unudur”.
Nə sənindir, nə mənimdir bu əməl,
Özgə bir yerdə danışma bunu gəl.
Qoparıb qəlbimi sən vurma daşa,
Gəl! Yaxın gəl! Oxuyub qıl tamaşa
Əsərimdən görünən heykəlimi;
Tutma, qoy yazsın, əzizim, əlimi.
Nə rəyasət, nə cəlal istəyirəm,
Sadə hiss, sadə xəyal istəyirəm,
– Məni şerinlə sevindirdin, əvət!
– Yaşasın öyləsə dünyada sənət!
Onun ardında nə hikmət görünür!.
Bütün insan və təbiət görünür.

*1933*

## DƏNİZ GƏZİNTİSİ

Sevgilim, gecənin renginə bir bax!
Sayrışan ulduzlar göz kimi parlaq.
Sallamış dənizə ay məndilini*,
Dəniz danışdırır öz sahilini.
Baxıb keçənlərə, göz qırpır mayak,
O bir keşikçidir hər zaman oyaq**.
Gəzdirir özünü böyük bir vapor,
Vaporda səslənir, döyünür motor.
Onun zirvəsində durur kapitan;
İndi təbiətə hökm edir insan.
Yorulmaq bilməmiş insanın əli
İnsan yer üzünə tanrı gələli.
Görünməz olmuşdur dənizin dibi,
Qayıq yırğalanır bir beşik kimi.
Dalğalar atlanır, dalğalar enir,
Doğru demişlər ki, şairanədir,
Qayıq gəzintisi mahtaba*** qarşı,
Sahildə səslənir gəzinti marşı.
Gəzdirir bizi də mehriban dəniz
Açılıb dincəlir sinirlərimiz.
Suda ilan kimi şütüyür qayıq...
Xavərim, yatmamış... sevgilim ayıq!..
Sevgilim, nə gözəl bahar gecəsi!
Bizə layla çalır dənizin səsi.
O kimdir sulara qəzəl oxuyur,
Cahana hər gələn bir əsər qoyur...
Sussun o bayquşun pərişan səsi;
Sevgilim istəyir həyat nəğməsi!
Dalğalar əsəbi, dalğalar qara,
Köksünü çırpdıqca bu dalğalara
Suda ilan kimi şütüyür qayıq,
Sevgilim yatmamış... sevgilim ayıq!..

*1933*

---

* Dəsmal (əl dəsmalı) mənasında
** Yəni
*** Ay işığı

## ÇƏNƏ SÖHBƏTİ

Qapılar bağlanır, gecə yarıdır,
Gəzir pəncərəmin qabağında ay.
Bu ay qaranlığı sorub əridir;
Buludlar dağılır uzaqda lay-lay,
Gəzir pəncərəmin qabağında ay.

Sevgilim yanımda yatır baş-başa,
Uzanır ortada çənə söhbəti.
Onun hər zamankı xoş təbiəti
Deyir: mehriban ol, mehriban yaşa,
Sevgilim yanımda yatır baş-başa.
– Doğru demişlər ki, qızların nazı
Onların eşqindən uzun olurmuş.
Yolunda illərcə süründüm azı,
Get-gəli sevməyir bizim quruluş...

– Qınama qızları, bu ehtiyatdır,
Dünyada tez qızan, tez də soyuyur.
Məhəbbət özü də canlı həyatdır,
Onun varlığını yaşayan duyur;
Dünyada tez qızan, tez də soyuyur.

– Xayır! Məhəbbətin gözü kor olur.
Onda nə ehtiyat, nə imtahan var.
Sevməyin hissi ki, ürəyə dolur
O bəzən güldürür, bəzən ağladır,
Onda nə ehtiyat, nə imtahan var.

– Bu sözdə doğruluq olsa da qismən,
Yenə də fikrinə qol çəkmirəm mən.
Ömür-gün sevdası deyildir asan,
Çox gözəl olsa da zahirən insan,
Yenə də ortada imtahan gərək.
Yoxsa ki, gündə bir eşqə gələrək
Hər ötən yolçuya könül bağlamaq.

Sonra da ardınca baxıb ağlamaq
Əskiklik gətirər hər insana, bil!
Nə erkək, nə qadın əyləncə deyil.
Bir parça söyləyim misal üçün mən
Həyatda gördüyüm bir faciədən:
Yaşıl təpələrdə izlər buraxan,
Yel kimi kükrəyib, su kimi axan
Qeydsiz bir könül, azad bir könül,
Ətirli bir çiçək ətirli bir gül
Gündə boy atardı günəşə qarşı;
Onun kaman kimi əyilmiş qaşı,
Durna baxışları, şirin söhbəti,
O gözəl xilqətin xoş təbiəti
Gəzib dolaşırdı ağızda, dildə;
"Xuraman" dedikcə ağız da, dil də
Gözəllik dadardı bu adda insan!
Bir nur tökülərdi baxışlarından.
Xuraman sevərdi ay işığını,
Xilqətin o gözəl yaraşığını;
Baxıb saatlarca mahtaba sarı,
Uçardı göylərə zil baxışları.
Bir su kənarında göyərən otlar,
Göydə məclis qurub duran buludlar
Bir qaya, bir təpə, bir dağ, bir dərə,
Xəyalı güldürən bir xoş mənzərə
Onun diqqətini tutardı həmən.
"Of...Sənin eşqindən divanəyəm mən"!
Deyən, bir insana uydu zavallı
O şair könüllü, rəssam xəyallı.
Xuraman izlədi, öz arzusunu,
Ondan çəkinmədi illər uzunu;
O qoşdu şəhərə oxusun deyə,
Ömrünü sənətə verdi hədiyyə.
Yazıq! Zəhərlədi o gözəl qızı
Həyatın pozulmuş bir əxlaqsızı.
"Mən sənin eşqinlə, əziz Xuraman,
Xəstə uşaq kimi inlərəm hər an", –

Deyən bir alçağa! uydu zavallı,
O rəssam duyğulu, şair xəyallı,
O dağlar gözəli Xuramancığaz.
Birinci görüşdən keçməmiş bir az
Onlar evləndilər, fəqət faciə
Bununla qurtarıb bitməyir yenə.
Xuraman bir axşam evində yalnız,
Çəkdiyi lövhələr qarşısında qız
Dalıb düşünərkən yoldaşı birdən:
"Xuraman, qalmamış o məhəbbətim,
Getdi etibarım, getdi hörmətim,
Nə incə sənətin, nə də bədənin,
Nə də ki, o durna gözlərin sənin
Artıq güldürməyir, açmayır məni,
Bağışla, saxladım yolundan səni.
Xuraman yerində daş kimi donur,
Xəyalı çırpınıb, dağlara qonur,
Orda maral kimi boynunu bükür,
Qumral gözlərinə qaranlıq çökür...

"Əvət, təbiətim hər zaman dönür,
Könül bir oddur ki, yandıqca sönür...
Məndə nə iradə, nə ixtiyar var;
Xəyalım ölçüsüz bir dəli ruzgar,
Köçəri quş kimi hər yerə qoşar,
Harda axşamlasa, orda da yaşar.
Onun başqa donlu bir xilqəti var,
Hər zaman dəyişən təbiəti var.
Səadət, ailə, sevgi əbəsdir –
Dünya dedikləri bir quru səsdir..."
O gündən yaşadı Xuraman yalqız,
Dünya gözlərində günəşsiz, aysız
Bir qaranlıq kimi boğurdu onu,
Yaxşı gətirmədi ömrünün sonu;
Dağlardan aldığı vüqarı qızın
Çəkmədi zülmünü bir əxlaqsızın.

Dəyişdi günbəgün qızcığın halı,
Pozuldu gördüyüm o gül camalı.
Pozuldu ömrümün ağ gün dəftəri
Qızlığı əllərdə gedəndən bəri.
Bir axşam ah çəkib asdı özünü,
Həyata, hər şeyə yumdu gözünü
Deyən sevgilimin sinəsi qalxdı,
Elə bil üstündə ildırım çaxdı.
Süzüldü göz yaşı kirpiklərindən,
Çəkib nəfəsini aldı dərindən.
Sevgilim yanımda yatır baş-başa,
Uzanır ortada çənə söhbəti;
Onun hər zamankı xoş təbiəti
Deyir: mehriban ol, mehriban yaşa!
Sevgilim yanımda yatır baş-başa...

*1933*

## CƏBHƏDƏ

Toxunub dağlara qayıdır yenə
Sərhəd boyundakı hücum borusu;
Soxulmuş gecənin dərinliyinə
Komandam altında insan ordusu,
Sərhəd boyundakı hücum borusu.

Atım köpüklənir, atım buğlanır –
Donmuş qırov kimi sinəsində tər.
Atımın nalları od tutub yanır;
O, bəzən altımda uçunub, titrər,
Donmuş qırov kimi sinəsində tər.

Topçular alayı gəlir arxadan,
Fırlanır, dolaşır təkər səsləri.
Bir yeni şey deyil nə ölüm, nə qan...
Ordumuz yenə də axır irəli,
Fırlanır, dolaşır təkər səsləri.

Günəş qırpınanda açıldı hava,
Dayandı ordular, durdu üz-üzə –
Hər iki cəbhədən başlandı dava,
Yayıldı atəşlər o geniş düzə,
Dayandı ordular, durdu üz-üzə.

Qızışdı, getdikcə qarışdı ara,
Gəldi toqquşmamız süngü-süngüyə;
Havanın bağrını düz yara-yara
Şaşqalar başını qaldırdı göyə,
Gəldi toqquşmamız süngü-süngüyə.

Odur bax! Ayrıldı tən yarısından
Gövdəsi qarşıma çıxan insanın;
Atından yıxıldı, yəhərində qan...
Qızardı od kimi içində qanın
Gövdəsi qarşıma çıxan insanın.

Axşamdır, qaralır axşamın yeri,
Düşməni salmışıq əldən-ayaqdan;
Basılmış ordusu çəkilib geri,
Kinli baxışlarla baxır uzaqdan,
Düşməni salmışıq əldən ayaqdan.

Çoyutma* bir güllə gözlənilmədən
Yapışır alnıma, yıxılıram mən,
Tutub gözlərimi örtür qızıl qan...
İnsan ölümünü bildiyi zaman
Nələr keçirirmiş!.. Kainat qara.
Kainat gözümdə çəkilir dara...
Dolanır başıma sonsuz yamaclar,
Yürüyür üstümə otlar, ağaclar,
Canımda bir qara üşütmə vardır,
Döyünən köksümün nəfəsi dardır;

Bu dar zamanımda hamıdan əvvəl
Qaldırır başımı mehriban bir əl,
Çəkib dizlərinin üstünə alır,
Bağlayıb yaramı qeydimə qalır
Və deyir: "Özünü toxtaq tut bir az,
Düşəndə dar günə insan darılmaz!"
Duyub bir insanın dost olduğunu,
Güclə tanıyıram səsindən onu.
O, cəbhə yoldaşım, öz sevgilimdir,
O, mənim ağzımda şirin dilimdir.
Silir gözlərimin qanını təmiz:
"Bir yerdə ölsəydik, deyir, ikimiz..."

*1933*

* Gözlənilməz

## ŞAİRİN SEVGİLİSİNƏ!

Sevgilim! Xavərim! Son bahar çağı
Uçub tökülürdü ömrümün bağı...
Həyata küsmüşdüm sözümün sağı,
Üzümə ilk dəfə gülən sən oldun,
Şairin qədrini bilən sən oldun.

Qaşların sürməsiz, üzün boyasız,
Budur xəyalımda aradığım qız.
Deyərək nə qədər sevindim, yalnız,
Qızların vəfası olmayır deyə,
Düşdüm əvvəlləri ümidsizliyə...

Rəng alıb rəng verən ismətinlə sən,
Həyata qaytardın məni yenidən.
O ilk təsadüfün xəyalilə mən
Həftələr yaşadım, aylar yaşadım
Bir gün evinizdə çəkildi adım...

Sən ey bağçaların, bağların barı!
Könlümün sultanı, qəlbimin yarı!
O gün, qapınıza gəldi çoxları
Fəqət sən dedin ki, ölməz sənətkar,
Mənim ölməzlərə məhəbbətim var.

Böyüdü heykəlin gözümdə əlan*,
Tüstülü bir duman qalxdı başımdan!
Bircə canım vardır, o sənə qurban
Haqdan istəmişəm yarıyaq qoşa,
Sən də de qocalaq, qarıyaq qoşa.

İndi xumar-xumar baxan gözlərin,
Süzülüb-süzülüb axan gözlərin,

* O andaca

Ruhumda bir günəş yaxan gözlərin,
Oldu sənətimin ilham ocağı!
Ömrümün ən gözəl, ən xoşbəxt çağı.

Boranlı qışlardan çıxmışam yaza,
Könlüm oynamayır gündə bir saza.
Baxıb camalına söz yaza-yaza,
Bir də söyləyirəm yarıyaq qoşa
Sən də de qocalaq, qarıyaq qoşa.

*1934*

## QAFQAZ

I

Uçurur fikrimi boşluqlara, bax:
Göyü xəncər kimi dümdüz yararaq
Uzanan dik qayalar, silsilələr;
Qara yellər ona dörd yandan əsər.
Ağ buludlar onu bərk-bərk sarmış.
Dəli Qafqaz! O, baharsız bir qış –
Deyə təsvir olunarmış hərdən;
Torpaq olmuş o keçən günlərdən
Sadə izlər görürəm daşlarda...
Ağ dumanlar ağarır qaşlarda.
Hələ dağlar, uçurumlar, dərələr,
O gözəlliklə gülən mənzərələr
Saxlayır yolçunu yoldan gecələr
Sayrışır göydəki ulduzlu səhər...

II

Burda at çapdı keçən azğınlar,
Burda yoxlandı qılınclar, qınlar.
Burda şahlar, dərəbəylər, xanlar,
Şəni-şöhrət keçirən xaqanlar
Çoxdan öz vaxtını tərk etmişdir,
Göyün altında sönüb getmişdir...

* * *

Elbrus! Söylə, bilinməzmi yaşın?
Göyə meydan oxuyan qarlı başın
Nə bəlalar, nə cəfalar çəkmiş?
Kimlərin gözləri hey yol çəkmiş?
Tökülən qanların haqqında danış!
Ona matəmmidir üstündəki qış?





III

Unudulmuş o keçən günlərdə,
Yaşamış ömrünü sürgünlərdə
Bir böyük şairin azadə səsi,
Qalır ancaq yenə dünyada səsi.
O sevərmiş bu gözəl Qafqazı tək,
O, yaşıllıqları yalqız gəzərək,
Düşünərmiş bəşərin taleyini,
Qamçılarmış göyü, qanunu, dini;
Arabir dinləyib əfsanələri,
Meyli, rəqqasəli meyxanələri,
Bir gülərmiş dodaq altından ona –
Bəşərin öylə gülünc olduğuna.

* * *

Mən də keçdim o qaranlıq gecədən,
Seyrə vardıqca o heçlikləri mən,
Deyirəm: torpağa dönmüş babalar
Uyub aldandı o boşluqlara hey...
İndi dönmüş və dəyişmiş hər şey!
Hər günün, hər gecənin bir canı var;
Qara torpaqlara dönmüş babalar.
İndi yoxdur uzanan qafilələr*,
İndi yoxdur o talanlardan əsər...

IV

Keçdi səssiz saralan axşamlar,
Qəmə qərq olmuş o odlar, şamlar...
Keçdi mizraqlı döyüşlər, qanlar,
Zınqırovlu dəvələr, karvanlar
Ki, bizim dağları aşmış hərdən...
Torpaq olmuş o keçən günlərdən
Sadə izlər görürəm daşlarda...

* Atlı dəstələri

Ağ dumanlar ağarır qaşlarda.
Başqadır indi bu dağlar, düzlər.
Nə gözəldir gecələr, gündüzlər;
Başqadır duyğu, şüur, iş, zəhmət,
Başqadır elm, düha, min hikmət.
Dinamitlər qoyulur dağlara, bax,
O qaranlıqlara yollar açaraq,
Göy qatarlar şığıdıqca irəli,
Daşınır zəhmətimin meyvələri.
Nə gözəldir, necə xoşdur gecələr,
Yolçular yoldaca rahat gecələr;
Nə qaçaq var, nə də quldur səsi var,
Nə "Soyun, ver!" nə də bir "Dur!" səsi var
Axır axdıqca qızıl karvanlar,
Yaşasın qardaş olan insanlar!

* * *

Bir zaman göz yaşı içmiş dərələr,
Qayalar, silsilələr, məşcərələr
İndi üç qardaşın olmuş vətəni...
Üçü bir yerdə düşündükcə, məni
Anacaqlar, sevəcəklər, bilirəm;
O zaman dağda küləklər, bilirəm,
Ötəcək bir gələcək şairini,
Bu günün, bəlkə də, tək şairini!..

*1934*

* * *

Üzərimdə qara-qara,
İlan başlı buludlar var...
Gəril, sinəm, hücumlara!
Ayğır dalınca toz qopar...

[*1934*]

## "ƏHLİ-QƏLƏM"

"Pul verin! Çox verin! Mən sənətkaram!
Yoxsa siyasətlə pozular aram...
Mənəm məmləkətin yol göstərəni,
Siz tay əlinizlə tutmayın məni!
Şairəm, imzamı hər yerə atın!
Bu bəsdir, tanısın məni həyatın,
Tarixin ən böyük qəhrəmanları,
Onlarsa imzamı oxusun barı...
Doğrudur... yazdığım iki parçadır,
Ürəyim haçadır, dilim haçadır;
Ağzıma çullu bir dovşan da sığmaz,
Mənim də qədrimi bilsinlər bir az.
Bir də ki, dünyada böyük adamlar
Sağlığında böyük ad almamışlar.
Neyləyim? Görünür taleyim budur,
Məni öz zəmanəm vaxtsız unudur.
Pul verin! Çox verin! Mən sənətkaram!
Yoxsa siyasətlə pozular aram...
Ellərə gedirəm, orda həyat var", –
Deyib, istədiyi məbləği alar,
Səfərdən geriyə qayıdan başı
Gülüb dil çıxarar həyata qarşı:
"Canım! Səs-küy imiş, əfsanə imiş,
Orda da görmədim, nə insan, nə iş.
Nə bir alicənab, nə bir qanan var,
Nə də ilham verən bir qəhrəman var.
Bütün uydurmadır bu söylənənlər...
Rəngi də rəngləmək nəyə gərəkdir?
Düşünsək həyatı dərindən əgər,
Bütün uydurmadır bu söylənənlər...", –
Deyib ağrımaz ki, onun vicdanı!
Bir də o insanda bu vicdan hanı?
Ağzı burulanda gülərək həmən
Xırda bir kitabça qapıb cibindən:
"Mənmiyəm yaramaz? Demək... demək siz...

Təşkilat üzvünü təhqir etdiniz...”,
Deyər bu bəzəkli sözlər ustası,
Alnına yüz dəfə basmışdır azı
Yumaqla getməyən bu ləkələri,
O əyri yollara düşəndən bəri.
İşində mahirdir, ustadır, fəqət,
Ondakı qüvvətli oynaq təbiət
Yazıq ki, izləyir başqa bir yolu,
Kinli baxışları həsədlə dolu.
Odur bax, özüdür! Bərbərxanadan
Basıb yanlarını çıxdığı zaman,
Kənardan-kənara seyr edin onu.
O qədər vurmuş ki, adikalonu,
Yayılmış qoxusu iki verstliyə.
“Dünyada keyf çəkim, gün görüm!” – deyə
Düşmüş gecələrin canına o quş...
Onda bu xəstəlik bir adət olmuş.
Gecədir, yorğundur o “əhli-qələm”,
Qafiyə axtarıb vurnuxur dəm-dəm.
“Zəhrimar! Elə bil gizlənib qəsdən,
Eh... nahaq başımı sındırıram mən;
Elə bu yazdığım adi sözlər də
Böyük görünəcək xırda gözlərdə,
Şeri və sənəti anlayan hanı?” –
Deyərək “əsrimin bu qəhrəmanı”
Bütün çətinliyin daşını atır,
Başını yastığa söykəyib yatır.

* * *

Səhərdir “şairin” zil baxışları
Uçur pəncərədən günəşə sarı.
Gülüb xumarlanır qoca təbiət;
“Şairin” ilhamı qurumuş fəqət;
“Kainat nə qadar!..” gəlməyir dalı,
“Ey... a yoldaş günəş!..” onun xəyalı
Yüksəyə qalxmayır topuqlarından...

Zorlanan bir qəlbin həyəcanından
Nə çıxar? Bir sürü boş söz anbarı.
İnsan öz qədrini bilsəydi barı!..
Təbiət! Nə böyük səxavətin var?!
Neçin yaranmışdır artıq adamlar?

Bununla bitməyir bu sorğu-sual,
Göstərim yenə də başqa bir misal:
Baxır jurnalların bir nömrəsinə,
Anlamaq istəyir qəsdən tərsinə
Ordakı bir şeri, gözəl yazılmış –
Göstərilir bahar, göstərilir qış...
Şerin kəlmələri axır su kimi,
Hücum zamanında bir ordu kimi
Yüksəldir insanın düşüncəsini,
Tüfəngin, yürüşün, topun səsini
Göstərir varlıqdan daha yuxarı,
Enir ucaldıqca həyata sarı.
Fəqət bu incəlik, fəqət bu sənət,
Hər sözün üstündə çəkilən zəhmət
Onun gözlərinə batır ox kimi;
O alçaq insanın ləkəli qəlbi
Titrəyir, döyünür, qızdırma çəkir,
Ən yaxşı sözləri seçərək bir-bir:
"Bunlar əskimişdir", – deyə uduxur.
Onun da vicdanı, duyğusu budur.
Təbiət! Nə böyük səxavətin var?!
Neçin yaranmışdır artıq adamlar?

Yoldadır, sallamış ağız-burnunu,
Gəlib gedənlərdən kim görsə onu
Deyər ki, bir əziz öləni vardır,
Heç deyən olmaz ki, o bəxtiyardır.
Rənginə çıxmışdır qəlbinin kini,
Saxta insanların qəlbindəkini
Sadə baxışlarla yoxlamaq olmaz.

Yorulma oxucum, hələ qulaq as:
Həsəd qurutmuşdur onun canını;
Aynaya tutsalar qara qanını
İçində quyruqlu qurdlar oynaşar,
Soxulmaq istəyir bizə bu azar.
Toplamış başına bir qara dəstə,
Hücuma keçmişdir sənətin üstə...
Yol uzun, o gedir...Tutun! Qoymayın!
Rəngini soldurar günəşin, ayın
Xəstəlik gətirən o qara bulut...
Yoldaş milisioner! O gedəni tut!

*1934, 5 mart*

## HƏSRƏT

Biz ayrılan zaman demişdin ki, sən:
– Bir də bu yerlərə gələcəkmisən?
O gündən bəriyə keçdi sənələr,
Başımdan keçəni danışsam əgər,
Qələm dilə gələr, kağız yorular,
Ömrümün qarışıq bir kitabı var...

Aldı qucağına məni şəhərlər
O həsrət qaldığım şehli səhərlər,
O qərib axşamlar, o axar sular,
Ətirli iydələr və akasyalar,
Ruzgara baş əyən o sarı sünbül
Baharın müjdəsi hər çiçək, hər gül,
Gecənin sarvanı o ulduz, o ay,
Anamın örtdüyü sarı kalağay,
Gözümdə qalmışdır ömrüm uzunu,
Bəlkə də şairin taleyidir bu...

Yaxşı yadımdadır, cənuba sarı
Uçub qaqqıldaşan durna qatarı,
Sıxlaşan, daralan qara buludlar,
Ocaqlı, tüstülü, şenlikli yurdlar,
O sulu daxmamız, ağac taxtımız,
O yoxsul ömrümüz, dolu baxtımız,
Babamın divardan asılı sazı,
Anamın "alnına yazılan yazı!".
Bir də görmədiyim o ana yurdu;
Bəlkə də şairin taleyidir bu...

Biz ayrılan zaman demişdin ki, sən:
– Bir də bu yerlərə gələcəkmisən?
Bağrımın başında alışıb yanan
Bu söz xatirimə düşdüyü zaman,

Səninlə ağlayan, səninlə gülən,
Səninlə yaşayan, səninlə ölən
Bir xəyal, bir könül, bir həyat, bir qan
Canlanır gözümdə... Sənsə bir insan,
Baxırsan tozlanan o ağ yollara.
İçində hər qüvvət çəkilir dara...
Mənsə bu həsrətin bir son övladı...
Səni də yandırır sonsuzluq adı...
Sən ey, isinməmiş ana qucağı!
Şair təbiətli sənət ocağı!
Gözlərim üstündə sənin yerin var.
Yolları almasın nə boran, nə qar...
Budur, bax, ən uzaq bir məsafədən
Salam göndərirəm hüzuruna mən.
Salam, təbiətin yaraşığına,
Salam, gecələrin ay işığına,
Salam, sevgilimin xoş qılığına,
Onun dözmədiyim ayrılığına,
Salam göz yaşımla içdiyim anda,
O məni sevəcək, məni duyanda!
Salam, inandığım o əziz günə,
Eşqin, gözəlliyin böyüklüyünə.
Salam, hər boyadan, ləkədən uzaq,
Varlığı, vicdanı günəş kimi ağ
Sabahkı insanın ilk nəğməsinə...
Səsini sən də qoş onun səsinə!
Salam, böyüdüyüm o ana yurda,
Mən səfər üstündə qonağam burda...
Süpür qapımızı, sula evmizi,
İndi birləşdirir ayıran bizi...
Bu bayram günündə gözlərin aydın!
İnan ki, dünyada sən olmasaydın
Nə söz yaranardı, nə də ki, sənət,
Bu haqqı vermişdir sənə təbiət.
Odur ki, dünyadan istədiyini al,

Zəhmətin də halal, südün də halal.
Səninlə fəxr edir şöhrətim, adım,
Adını ömrümdə heç unutmadım...
Anama sadə bir sözüm var ancaq:
Bir ağac altında bir parça torpaq
Ayır ki, yurd salım kölgəsində mən,
Əyləşim, söz açaq doğan səhərdən...
Çəkək kölgəliyə yazı masamı,
Yazıb pozduğumu oxusun hamı;
Dinləsin səsimi çiçəklər, otlar,
Dolansın başıma göydə buludlar!
Bu sadə istəyim dünyaya dəyər.
Verdiyim vədədən çəkinsəm əgər,
Göyün ildırımı başımda sönsün,
Ahım dağlardakı dumana dönsün!

*1934, 16 oktyabr*

## SABAHIN TÜRKÜSÜ

Ey səhər, ey Günəş, ey ulu qüvvət!
Sən ey şəfəqlərdə çimən təbiət!
Sonsuz üfüqlərə yol açan sənət!
Ey bütün bəşərin sabahkı yolu!
Yaşasın torpağın qəhrəman oğlu!

Sən ey bağçaların, bağların barı!
Şairin ilhamı, sənətin yarı!
Dünyanın əvvəlki, sonku ilqarı!
Açıq söyləmirəm sənin adını,
Bir də buludlara çırp qanadını!..

Sən ey qaranlığa çöküb qarışan,
Günəşlə tutuşan, ayla yarışan,
Gah məndən inciyən, gah da barışan,
Yurdumun ayağı sayalı qızı!
Ağzı xeyir sözlü, həyalı qızı!

Siz ey çəmənlərdə gülən çiçəklər!
Bu sakit ahəngi pozan küləklər!
Ey təmiz duyğular, təmiz ürəklər!
Salam gələcəyin böyük adına!
Salam insanlığın etiqadına!

*1934*

## VƏTƏN ORDUSU

*Nəğmə*

Qorxub çəkilmədik ölümdən, qandan,
Çıxdıq illər boyu çox imtahandan;
Bombalar yağsa da bizə hər yandan,
Dağlara səs salar hücum borusu,
Haydı, arş irəli, Vətən ordusu!

Pozmaz cərgəmizi nə dərə, nə düz,
Hazırdır döyüşə qızıl süngümüz.
Hər gün meşələrdə vurduq yüzə yüz;
Dağlara səs salır hücum borusu,
Haydı arş irəli, Vətən ordusu!

Bizik kəc yağının döşündən vuran,
Azadlıq yolunda keşikçi duran;
Bizik tarixləri yenidən quran.
Dağlara səs salır hücum borusu,
Haydı, arş irəli, Vətən ordusu!

Qüvvəmiz günəşə, aya təməldir,
Sinifsiz gələcək bizə əməldir,
Ən böyük nəğməmiz Beynəlmiləldir;
Dağlara səs salır hücum borusu,
Haydı, arş irəli, Vətən ordusu!

Yaşa, qızıl əsgər, yaşa, min yaşa!
Aldığın nişanlar çıxmasın boşa!
Salam marşalımız Klim yoldaşa!
Dağlara səs salır hücum borusu,
Haydı, arş irəli, Vətən ordusu!

*1934*

## BÖYÜK REVOLYUSİYA

Üç yüz il acımadan, titrəmədən, duymadan,
Hey diddi köksümüzü çarlığın zülüm quşu.
Üç yüz il acımadan, yorulmadan, doymadan,
Hey sordu qanımızı, hey içdi qanımızı,
Buludlardan şığıyıb gələn bir ölüm quşu.

* * *

Üç yüz il, hey üç yüz il... ac yalavac dolandıq,
Zəncir, buxov taxıldı haqqın dodaqlarına.
Üç yüz il, hey üç yüz il... çox qaynadıq, çox daşdıq.
Bizi nə göy dinlədi, nə də zərli salonlar,
Hətta sərildiksə də, çarın ayaqlarına.

* * *

Üç yüz il, hey üç yüz il sürünərək dinlədik,
Ağlayan zənglərdəki tanrıların səsini.
Tanrıların səsini dinlədikcə inlədik,
Sonra yaxşı bildik ki, lazımdır bizə qırmaq,
Çarın qanlı tacını, caduların tasını...

* * *

Döyüşlərdə itəcək nəymiz vardı ki, candan,
Ağır çəkicdən başqa, paslı zəncirdən başqa.
Zərbəmizlə yıxıldı bizi alan və satan,
Sönməz odlarımızla dəbdəbəli saraylar,
Tanrılar külə döndü gözləri baxa-baxa.

* * *

Revolyusiya yarandı qanlı vuruşmalardan,
Mərmilərdən qaynayıb coşdu Neva suları.
Petroqradın üfqündə qızardı bir yeni dan,
Qızıl revolyusiya gətirdi ölkəmizə,
İpək damarlarında günəş parıltıları.

*1934*

## A KÖHLƏN ATIM!

Əlim tərpənməmiş oyna yerindən,
Nəzil qamçı kimi səyirdəndə sən.
Büdrəsən, qalaram yarı yolda mən,
A köhnə yoldaşım, a köhlən atım!
Buğlana-buğlana köpüklən, atım!

Aranda, yaylaqda kömək ol elə,
Yerişin oxşasın əsən ağ yelə;
Arpanı kəsmərəm ac qalsam belə,
Yaman günlərimin gərəyi atım,
İnsanın dar gündə köməyi atım.

Qoy vurum belinə gümüş yəhəri,
Bir yol ayrıcında açaq səhəri...
Gəzib oymaq-oymaq kəndi, şəhəri,
Harda var axtaraq düşmanı, atım!
Onları vaxt ikən gör, tanı, atım!

Bu bir manevradır indi səninçin...
Qoy dalğalar kimi döyünsün için;
Göydən üstümüzə düşən göyərçin
Düşmənin yerini bildirsin, atım!
Qoyub dizlərini yerə sin*, atım!

Qaranlıq düşəndə qulağını çat,
Asta get, nalıyın səsini alçalt!
Desinlər ustadır mindiyin bu at,
Candan əziz tutum səni mən, atım!
Bəzən insan kimi düşünən atım!

Canın poladdandır, qolların dəmir;
Komandan orduya verəndə əmr,
Düşmənin başını qoparıb gəmir,
Ey aslan ürəkli, pəhləvan atım!
Əslində mülayim, mehriban atım!

*1934*

---
* Əyil

## BÖYÜK ƏDİB

Döydü qapımızı bir acı ruzgar,
Durdu insan qəlbi, öldü sənətkar...
Mənim təbiətə bir sualım var.
Bumudur insanla onun ilqarı?

Sən, ey bu torpağın əziz insanı,
De, qələmin hanı? Kağızın hanı?
Matəmin ağlatdı Azərbaycanı,
Yasını saxlayır Qafqaz dağları.

Gülən dodaqların, söylə soldumu,
Düşünən beyinin torpaq oldumu,
Sevgilin saçını bir-bir yoldumu,
Həyata son dəfə baxdınmı barı?

Adını qəlbində hər kim arasa,
Bilirəm, ağlayıb batacaq yasa;
Bir xəbər göndərsin Kürə, Araza
Dumanlı dağların soyuq ruzgarı.

Ömrünün çiçəyi birdən solsa da,
Ölümün, matəmin vaxtsız olsa da,
Dünya boşalsa da, dünya dolsa da,
Tarix yaşadacaq bu sənətkarı!..

*1934, 31 dekabr*

## AZƏRBAYCAN*

Çox keçmişəm bu dağlardan,
Durna gözlü bulaqlardan;
Eşitmişəm uzaqlardan
Sakit axan arazları;
Sınamışam dostu, yarı...

El bilir ki, sən mənimsən,
Yurdum, yuvam, məskənimsən,
Anam, doğma vətənimsən!
Ayrılarmı könül candan?
Azərbaycan, Azərbaycan!

Mən bir uşaq, sən bir ana,
Odur ki, bağlıyam sana:
Hankı səmtə, hankı yana
Hey uçsam da yuvam sənsən,
Elim, günüm, obam sənsən!

Fəqət səndən gen düşəndə,
Ayrılıq məndən düşəndə,
Saçlarıma dən düşəndə
Boğar aylar, illər məni,
Qınamasın ellər məni.

Dağlarının başı qardır,
Ağ örpəyin buludlardır.
Böyük bir keçmişin vardır;
Bilinməyir yaşın sənin,
Nələr çəkmiş başın sənin.

Düşdün uğursuz dillərə,
Nəhs aylara, nəhs illərə.
Nəsillərdən nəsillərə
Keçən bir şöhrətin vardır;
Oğlun, qızın bəxtiyardır...

---

* Şeir əlyazması əsasında ilk variantda olduğu kimi verilmişdir.

Hey baxıram bu düzlərə,
Ala gözlü gündüzlərə;
Qara xallı ağ üzlərə
Könül istər şeir yaza;
Gəncləşirəm yaza-yaza...

Bir tərəfin bəhri-Xəzər,
Yaşılbaş sonalar gəzər;
Xəyalım dolanar gəzər
Gah Muğanı, gah Eldarı,
Mənzil uzaq, ömür yarı!

Sıra dağlar, gen dərələr,
Ürək açan mənzərələr...
Geyran qaçar, cüyür mələr,
Nə çoxdur oylağın sənin!
Aranın, yaylağın sənin.

Keç bu dağdan, bu arandan,
Astaradan, Lənkərandan.
Afrikadan, Hindistandan
Qonaq gəlir bizə quşlar,
Zülm əlindən qurtulmuşlar...

Bu yerlərdə limon sarı,
Əyir, salır budaqları;
Dağlarının dümağ qarı
Yaranmışdır qarlı qışdan,
Bir səngərdir yaranışdan.

Lənkəranın gülü rəng-rəng,
Yurdumuzun qızları tək.
Dəmlə çayı, tök ver görək,
Anamın dilbər gəlini!
Yadlara açma əlini.

Sarı sünbül bizim çörək,
Pambığımız çiçək-çiçək,
Hər üzümdən bir şirə çək
Səhər-səhər acqarına,
Qüvvət olsun qollarına.

Min Qazaxda köhlən ata,
Yalmanına yata-yata,
At qan tərə bata-bata,
Göy yaylaqlar belinə qalx,
Kəpəz dağdan Göy gölə bax!..

Ey azad gün, azad insan,
Doyunca iç bu bahardan!
Bizim xalı-xalçalardan
Sər çinarlar kölgəsinə,
Alqış günəş ölkəsinə!

Könlüm keçir Qarabağdan,
Gah bu dağdan, gah o dağdan;
Axşam üstü qoy uzaqdan
Havalansın Xanın səsi,
Qarabağın şikəstəsi.

Gözəl Vətən! Mənan dərin,
Beşiyisən gözəllərin
Aşıq deyər sərin-sərin,
Sən günəşin qucağısan
Şeir, sənət ocağısan.

Ölməz könül, ölməz əsər
Nizamilər, Füzulilər!
Əlin qələm, sinən dəftər,
De gəlsin hər nəyin vardır,
Deyilən söz yadigardır.

Bir dön bizim Bakıya bax,
Sahilləri çıraq-çıraq,
Buruqları hayqıraraq
Nərə salır boz çöllərə,
İşıqlanır hər dağ, dərə.

Nazlandıqca sərin külək
Sahillərə sinə gərək,
Bizim Bakı – bizim ürək!
İşıqdadır qüvvət sözü,
Səhərlərin ülkər gözü.

Gözəl Vətən! O gün ki, sən
Al bayraqlı bir səhərdən
İlham aldın...yarandım mən.
Gülür torpaq, gülür insan
Qoca Şərqin qapısısan.

El bilir ki, sən mənimsən,
Yurdum, yuvam, məskənimsən,
Anam, doğma vətənimsən!
Ayrılarmı könül candan?
Azərbaycan, Azərbaycan!

*1935*

## SƏRGÜZƏŞT

Bir tərəfdə düyün, bir tərəfdə yas,
Böylə keçinmişdir dilsiz əsrlər.
Şairim, könülün dediyini yaz,
Odur bu dünyada ən böyük əsər.

Deyirlər bu yerin xəyalı şaşqın
Ağızlarda gəzən sevdası varmış.
Könüllər havalı, duyğular daşqın
Sel kimi kükrəyib, coşub axarmış.

Deyirlər suların axar yerində
Çadırlar qurulub yurd salınarmış.
Dumanlı dağların ətəklərində
Mal-qara bəslənib, ot çalınarmış.

İlxılar qarışıb kişnəyəndə at
Batarmış göylərin ildırım səsi,
Burda öz-özünə axarmış həyat,
Axarmış suların xoş zümzüməsi.

Üstündə qıy vurub tərlan səslənən
Dağların başını duman alarmış.
Günəşdə, havada, suda bəslənən,
İnsanlar az ölüb gec qocalarmış.

Axarmış su kimi südü, ayranı,
Şəkinin, Şirvanın, Gəncəbasarın.
Qarışıb bir yerə dağı, aranı,
Dili tutularmış boranın, qarın.

Qaçanda Qazağın köhlən atları
Bağrı yarılarmış dəli göylərin.
Çökərmiş altında yerin qatları,
Dirəyi titrərmiş ağac evlərin.

Qoyunlar, quzular düzdə, bələndə*,
Səs-səsə verişib, mər-mər mələrmiş.
Qapıya bir əziz qonaq gələndə,
Xınalı erkəklər qurban gələrmiş.

Deyirlər, qocalar, düşkün qarılar
Qaranlıq damlara doldurularmış.
Acından quruyub, ölərmiş onlar
İnsanın nə yaman adəti varmış.

Sonra cəsədləri atıb çöllərə,
Didib dağıdarmış qurdlar və quşlar.
Tarix bir karvandır, həyat bir dəvə,
Bir əfsanə gəlir bizə olmuşlar.

Dillənin, ey sönmüş atəşgədələr!
Odlara yandımı dağlar gözəli?
Tarix, de başından keçmişdir nələr?
Nələr törətməmiş insanın əli?

Ey böyük bəşərin çocuqluq yaşı,
Nə çirkin, nə gülünc bir keçmişin var!
Atəşlər aşiqi Zərdüştün başı
Qalmış əsrlərdən bizə yadigar.

[*1935*]

---
* Çöldə

## ZƏRDÜŞTÜN XÜLYALARI

Üç min il keçəcək dönəcək zaman
Batacaq yaslara xain Əhrimən,
“Təslimən” – deyəcək ulu Hürmüzə,
Qaranlıq gecələr dönüb gündüzə,
Əlvida deyəcək qaranlıqlara...
Günəş hökm edəcək borana, qara.
Yerdən çəkiləcək soyuq və azar,
Hər günün, gecənin bir qanunu var.
Ətirlər saçacaq ətrafa güllər,
Gecənin qoynunda ötən bülbüllər
Səs-səsə verişib toy başlanacaq.
Həyat seviləcək, alqışlanacaq...
Aşıb-daşacaqdır bağlar, bağatlar
O vaxt uzanacaq günlər, saatlar,
Gecənin ömrüsə gödələcəkdir!
Tarixə böylə bir gün gələcəkdir!
Düşəcək sulara ulduzlar, aylar.
Artıq olmayacaq körpüsüz çaylar,
Əriyib axacaq dağların qarı,
İlanlar mələşən çöllərə sarı.
Yaşıl don geyəcək susuz yamaclar,
Boysuz olmayacaq otlar, ağaclar.
Dünyanın şöhrəti olacaq insan,
Nə azar qalacaq, nə ölüm, nə qan.
İnsan oğlu yer üzünə
Gəldiyindən ta bu günə
Qapılmışdır xəyallara...
İstərmisən? Get də ara.
Sirri dərin, fikri dərin
Daş ürəkli əsrlərin
Əfsanələr ocağını!

Al da onun sorağını
Divarları uçub qalmış

Yazısını tozlar almış
Məbədlərin görüşündən...
Gəl oxucum! Yaxın gəl sən!

İnsan oğlu azad bir quş
Əzəldən o məftun olmuş
Azadlığın xülyasına.
Atıldıqca dəryasına,
Xəyalların, fikirlərin,
Bəzən dayaz, bəzən dərin
Dənizlərdə kürək çəkmiş...
Tarix nələr görəcəkmiş!

O gəzdikcə hər ölkəni
Dənizlərin ağ yelkəni
Dalğaları yara-yara,
Yellənmişdir uzaqlara.
Dənizlərdə qopan ruzgar
Qasırğalar, fırtınalar
Quduz kimi hey qudurmuş
İnsanla üz-üzə durmuş.
Gəl, ey Zərdüşt! Gəl də dinlə!
Hesablaşaq biz səninlə
Tarix uzun bir körpüdür
Əfsanədən həqiqətə...
Bax insana, təbiətə,
Bax gecəyə, bax gündüzə,
Sığındıqca sən Hürmüzə,
Xəyalların söndü göydə
Yer başına döndü, göy də.
Daha bilməm keçdi nələr
Sən ey sirlər, əfsanələr,
Dünyasının böyük başı!
Ulduzların ilk sirdaşı!
Uzaqdansa dinlə barı
Səndən sonra olanları!

İnad bəşər yorulmamış,
Nə yay bilmiş, nə də ki, qış
Nə soyuqdan, nə istidən,
Nə alovdan, nə tüstüdən
Qamaşmışdır gözlərimiz.
Dəryaların sirrini biz
Çox aradıq, çox axtardıq,
Gedər-gəlməzlərə vardıq...
Bizim cəsur elçilərdən
Bir parası batıb hərdən
Girdabları yara-yara
Yem olmuşdur balıqlara!

Yerin şöhrətidir əzəldən insan,
İnsan yer üzünə tanrı gələli.
Bir tərəfdə həyat, bir tərəfdə qan,
Nələr yaratmamış insanın əli!

Bəşər yorulmamış əsrlər boyu
Açarsız, qapısız əfsanələrdən,
Könül bir çeşmədir ki, onun suyu
Yağışlar altında bulanmış hərdən...

Bir yanda şahların qan rəngli tacı,
Bir yanda zəncirli qullar dünyası.
Bir yanda bir quru çörək möhtacı,
Sakit axşamların qərib röyası.

Nəbilər, dahilər, ərlər, ərənlər,
Həyat meydanında çapmış atını.
"İşıqlı bir günə yol göstərənlər",
Tapdamış bəşərin xatiratını.

[*1935*]

## FÜZULİNİN DƏRDİ

*Şəbi-hicran yanar canım.*
*Tökər qan çeşmi-giryanım.*
*Oyadar xəlqi əfqanım.*
*Qara bəxtim oyanmazmı?*

***Füzuli***

Sən ey sevdalı sənətkar,
Səsində min şikayət var.
Duyanlar hər zaman ağlar,
Desəm, bir böhtan olmazmı?

Sığındın təbi valaya*,
Vuruldun hüsnü Leylaya.
Nahaqdan düşmə sevdaya,
Gözün yaşlarla dolmazmı?

Xəyalə qərq olub hərdən,
Zəhərləndin küləklərdən...
O qansız, daş ürəklərdən
Könül rəncidə** qalmazmı?

Nə odlar görmüsən bilsən,
Əzəldən aşiq oldun sən,
Böyük ruhunla bir türksən,
Muradın şəmi yanmazmı?

Füzuli, incidin yardan,
Gileyləndin saraylardan...
Keçirkən karvanın qardan,
Dedin üz döndərən yazmı?

Səninlə oynadı dövran,
Doyunca öpmədin yardan,
Əsən sevdalı ruzgardan
Tənəffüs ruha sığmazmı?

* Ali, yüksək
** İncik

Nədir Leyli, nədir Məcnun?
Nədir aşiq, nədir məftun?
Gəzirsən daima məhzun*.
Sınıq qəlbin – sınıq sazmı?

Yıxılmış gördüyün dövran,
Dəyişmiş, başqadır insan,
Azərbaycan, Azərbaycan,
Böyük dahilərin azmı?

Sən ey sevdalı sənətkar,
Səsində min şikayət var.
Duyanlar hər zaman ağlar
Desəm, bir böhtan olmazmı?

[*1935*]

* * *

Döyür pəncərəmi qışın ruzgarı
Vaxtsız ölümmüdür üstümə gələn?
Çəkilsin gecənin qaranlıqları...
Ömrə son sözümü deməmişəm mən,
Vaxtsız ölümmüdür üstümə gələn?

*1935, 5 yanvar*

* * *

Ruhumda ruhunun parçası vardır,
Təşəkkür yetirək təbiətə biz.
Xavərim, ömrümüz nə bəxtiyardır,
Xalqı küsəndirir səadətimiz.

*1935, 12 yanvar*

---
* Kədərli, qəmli

## ŞAİRİN ÖLÜMÜ

İndi xəbər verim oxucuma mən
Xəyalı küsdürən bir faciədən:

* * *

Qarabağ... Şuşada zəngin bir saray,
Açılır qapısı, örtülür lay-lay;
Onun divarları al-əlvan naxış,
Əsrdən əsrə hədiyyə qalmış...
Burda göstərilir quşa ox atan,
Burda göstərilir min bir pəhləvan.
Qılınclar, nizələr, yumruqlu qollar,
Döyüşən insanlar, ayrılan yollar
O qanlı günlərdən bir yadigardır,
Onun da sirli bir tarixi vardır.
Sarayda hökm edir ədalı bir xan,
Qan-qarğış tökülür qaş-qabağından,
Hər gün at belində... dəliqanlıdır,
Ürəyi fitnəli, əli qanlıdır;
Onun sarayında hərəmxanalar –
Salınmış qəfəsə nazlı sonalar...
Ellər talan olur, vergilər ağır;
Göylər cavabsızdır, buludlar sağır.
Yalnız səadətlə gülür bu saray.
Açılır qapısı, örtülür lay-lay.

* * *

Burda gün keçirir bir böyük şair,
Yazır yazdığını həyata dair...
O şair mədh edir min bir gülzarı,
Bəlalı aşiqi, sevdalı yarı.
Baxıb durnaların yaşıl telinə,
Ərməğan göndərir Bağdad elinə.
Bu sonsuz dərələr, qalın meşələr,
Boynu bükük duran tər bənövşələr
Şairin sənəti, ilham ocağı...

Ömrünün bəxtiyar, qayğısız çağı.
Bəzən xatırlayır Kür qırağını,
Alır kəkliklərin ilk sorağını.
Şairin ilhamı gözəldir deyə
Əzəldən aşiqdir o gözəlliyə;
Baxır kəlağaylı keçən gəlinə,
Qarğı qələmini alır əlinə;
Könlünü bəsləmiş sazlar elində,
Deyir türküsünü ana dilində;
Səsinə səs verir dağda çobanlar...
Bükür qamətini ağır zamanlar...
Yazır çəmənlərdə yarın seyrini,
O böyük şairin hər bir şerini
Deyir laylasında bizim analar.
Ölərmi yurdunu sevən sənətkar?!
Vaqif, ey şerimin könül dastanı,
De, söhbətin hanı, de, sazın hanı?
Susdumu nəğmələr oxuyan dilin?
Yasını tutdumu barı sevgilin?

* * *

Batdımı xəncəri xanın köksünə?
Nifrət o alçağa! Nifrət o günə!
Noldu söylədiyin axar qoşmalar?
Andımı həsrətlə səni hər nigar?
Şahidin oldumu üfüqdəki ay?
Söylə, yıxıldımı o məğrur saray?
De, sənmi söylərdin son dəfə naçar:
Bir yandan bağlayan, bir yandan açar.
Vaqif, ey şerimin könül dastanı,
De, söhbətin hanı, de, sazın hanı?
Ey könül yolçusu, gülər sənətkar,
Qədrini bilmədi sənin saraylar.
İran ordusunu yeridəndə, sən
Dedin ki, yadlara keçməsin vətən!
Dedin: sərçeşmələr, dağlar bizimdir,

Almalı, armudlu bağlar bizimdir
Dedin ki, türk dili, türk şeri gərək
Böyük bir ölkəyə qanad gərərək,
Üfüqdən üfüqə çapsın atını.
Əziz bir ölkənin xatiratını
Verməyək dağıdan, vuran əllərə,
Doğma sənət gərək bizim ellərə.
Yazıq, sən deyəni demədi ruzgar,
Çəkdi ordusunu Məhəmməd Qacar,
Gözündə fırtına, baxışında qış,
O insan qatili, o axtalanmış...
Keçdi pəncəsinə onun Qarabağ
Qayalar titrədi əlində zağ-zağ.
Nişanlı qızların açıldı üzü,
Qaldı ürəyində Vaqifin sözü...
O qanlı günlərə şahid idin sən,
Divarlar töküldü güllə səsindən .
Naxışlı xalçalar, uzun xalılar,
Babalar yurdundan qalan yadigar,
“Hədiyyə” verildi o yaramaza;
Sənsə gördüyünü düz yaza-yaza,
“Dünyada doğru bir halət görmədin,
Bütün əyri gördün, babət görmədin”.

* * *

De, sənmi söylədin son dəfə naçar:
Bir yandan bağlayan, bir yandan açar.
O dövran qatilə oturdu baha –
Yatıb, sağ çıxmadı cəllad sabaha.
Qəhrəman bir oğul, polad bir ürək
Onun otağına yalnız girərək.
Çaldı xəncərini ilan başından.
Zindanı, zənciri sevməmiş insan...
Səninsə qəlbinin əsdi telləri,
Yazdın Vidadiyə bu şad xəbəri.

O da həyatının ixtiyar yaşı,
Yönünü döndərib qibləyə qarşı,
Dilində surələr, durdu namaza,
Lənətlər oxudu o yaramaza.
Vaqif, ey şerimin könül dastanı!
De, söhbətin hanı, de sazın hanı?
Dəydimi xəncəri xanın köksünə?
Nifrət o alçağa, nifrət o günə!
Keçdi qərinələr, keçdi əsrlər,
Torpaqda qalmadı qullar, əsirlər...
Ey böyük sənətkar, ey böyük insan,
Nə olar başını yerdən qaldırsan! –
Kainat gözünə görünər röya,
İndi bambaşqadır gördüyün dünya!
Durulmuş, şairim, bulanmış sular,
Döyüşlər, mizraqlar, azğın ordular...
Saraylar əbədi torpağa dönmüş,
Məscid şamları da əriyib sönmüş.
Nə bir əzan səsi, nə minarə var,
Nə də fırıldaqçı, azğın imamlar.
Dəyişmiş bu hava, dəyişmiş bu yer.
Odur, qalstuklu duran pioner
Açıb qarşısında külliyyatını,
Öyrənir, şairim, o, həyatını,
Onunla birlikdə uçur xəyalın:
"Ənliyi, kirşanı neylər camalın,
Sən elə gözəlsən binadan, pəri!"
Sözlərin olmuşdur dillər əzbəri.
Dolansan dünyanı sən qarış-qarış.
Tarix bir meydandır, ömür bir yarış.
Ölkəmiz yarışın ön səflərində,
Bir yeni dünya var hər əsərində...
Uçan buludlar da çağırır "gəlin!"
Qalxacaq, şairim, bir gün heykəlin
Bizim Qarabağın Cıdır düzündə,
Vaqif canlanacaq onun üzündə...

*1935*

## SƏNƏT EŞQİ

Vuruldum o gün ki, şerə, sənətə
Unutdum sevdiyim əyləncələri.
Aşiqəm insana və təbiətə
Əlim qələm tutub yazandan bəri.

Bəzən xəyalımda uçur buludlar,
Bir qətrə böyüyüb bir dəniz olur.
Dünyanın ölməyən bir qanunu var,
Bir yandan boşalır, bir yandan dolur.

Mənsə bu varlığın içində qaynar
Bir vulkan kimiyəm, gözlərimə bax;
Könül tərlan kimi baş alıb oynar
Buluddan buluda qanad çalaraq.

İnsanlar dost kimi oxuyur məni,
Sözüm ağızlarda əzbər çəkilir;
Əlimlə qurduğum sənət bağında
Ətirli lalələr, güllər əkilir.

Öylə səfərbərəm, öylə hazıram,
Qarşımda diz çöküb göylər alçalır.
Bir yanda kağıza mən söz yazıram
Bir yanda sevgilim piano çalır.

*1935*

## ORDENLİ QƏHRƏMAN

Yenə də sayrışır göydə ulduzlar
Gecədən keçmişdir, doğmayır səhər.
Dərin bir yuxuya getmişdir şəhər
Yerdə nə hərəkət, nə hənirti var.
Yalnız milisioner küçələrdə tək
Gəzir ayaq üstə mürgüləyərək.

* * *

Ay da güzgüsünü salmış dənizə
Dəniz gümüş kimi par-par parıldar.
Həyat müvəqqəti vergidir bizə
Hər baxış könüldə qalır yadigar.
Uğurlar sənə ey qoca kainat
Yaşasın gələcək, yaşasın həyat.

* * *

Burda əfsanələr, sirlər yuvası
Viran Qız qalası dalmış səcdəyə.
O bəlkə yalvarır-yaxarır göyə
Yazıq ki, gecənin bu xoş havası,
O sınğın ruhuna yenə dar gəlir,
Xəzərdən üstünə bir ruzgar gəlir.

* * *

Əvət! Qamçılayır, döyür bu ruzgar
Dilsiz əsrlərin xatiratını.
Üstündə nəslimiz çapır atını,
Hər günün, gecənin bir qanunu var.
Öldü xan sarayı, xan əsgərləri,
Öldü minarənin azan səsləri.
Yüksəlir bir bina başqa tərəfdən
Ağarmış bənizi ay işığında.

Onun bu axşamkı yaraşığında
Başqa bir gözəllik duyuram da mən
Bu lövhə qaynadır yenə qanımı
Sizə təqdim edim qəhrəmanımı:
Qəhrəmanım yeni, şöhrəti yeni
Döşündə Leninin qızıl ordeni.
Nədir alnındakı o qırışıqlar?
Onda cəbhələrdən xatirələr var.
Neçə çiçəkli yaz, neçə qarlı qış
Sürgündə yaşayıb qürbətdə qalmış,
Qolunda səslənmiş zəncir səsləri
Ona gün verməmiş polis nəfəri.
Gecələr də qara...zindan da qara...
Salınmış zülm ilə qaranlıqlara.
Fəqət çəkinməmiş o öz yolundan
Ümidlər gözləmiş gələcək ondan.
Uğurlar sənə, ey qoca kainat
Yaşasın gələcək, yaşasın həyat.

* * *

Çıxmış qəhrəmanım yenə balkona,
Alqışlar göndərir ulduzlar ona.
Ay da işığını salmış üstünə
Alqış bu insana! Alqış bu günə!
Gecədən keçmişdir, yatır canlılar
Gecənin qəlbində bir döyüntü var.
Yalnız o yatmamış hələ sayaqdır[*]
Düşünən bir beyin yaşayacaqdır...
Onun gözlərinə yuxu gəlməyir
Onun sinirləri heç dincəlməyir.
Çarpışır, vuruşur, düşünür, duyur,
Gəzinir, əyləşir, yazır, oxuyur.
İştə[**] bir həyat ki, hərəkətdədir
İştə bir qanun ki, təbiətdədir.

---

[*] Sayıq
[**] Elə

* * *

O bəzən sevinir gülümsəyərək
Qabardır döşünü böyük bir ürək.
Dünya gözlərində bir xoş mənzərə
Əl çalıb oynayır hər dağ, hər dərə.
Bəzən də hirslənir, oynayır gözü,
Birdən bulud kimi tutulur üzü.
Ruhunu, qəlbini bir duyğu sıxır,
Başından tüstülər, dumanlar çıxır.
Nədir düşündürən bu qədər onu?
Bəşər duyğusunun varmıdır sonu?

* * *

Mənim qəhrəmanım nə evlər sökür,
Nə qanlı hərb üçün planlar tökür.
Görsə bir insanın o göz yaşını
Ürəyi dərdlənib, çatar qaşını.
Nə yurdlar, yaylalar, müstəmləkələr,
Nə qızıl mədənli böyük ölkələr
Onun təmənnası deyildir əvət.
O başqa bir könül, başqa təbiət.
Napolyonlar kimi ordu çəkməmiş,
Yandırıb yerində bostan əkməmiş.
Atını çapmamış o dörd bir yana,
Əlləri batmamış günahsız qana.
Çingiz xanlar kimi Əfqanda, Çində
Qılınclar çalmamış qanlar içində.
Güvənib gücünə, istedadına
Saraylar qurmamış o öz adına.
O başqa bir könül, başqa vüqardır
Onun göylər qədər mənası vardır.

* * *

Gəlir gözlərinin önünə bəzən
Qoynunda ceyranlar, cüyürlər gəzən,

Şirvanın, Muğanın, Eldarın düzü
Gülür qəhrəmanım, açılır üzü.
Əlilə tarladan ağ pambıq dərir,

Ellərə ruh verir, yollar göstərir.
Onun sadəcə bir əxlaqı vardır
Gəncliyə ən gözəl bir yadigardır.
Ellərə yazdığı bir şeri ələn
Oxuyur yazdığı bloknotundan:

“Ay ellər, nə gözəl, nə xoş gəlibdir
Uğurlu baharı, yazı pambığın.
Doğrudan ağıza, dilə düşübdür
Məclisi, söhbəti, sazı pambığın.

Xoş gəlib bu qonaq bizim bu kəndə,
Qarış cərgəmizə dayanma sən də,
Səhərin qoynunda yellər əsəndə,
Can alır işvəsi, nazı pambığın.

* * *

Nə bir dilənçi var, nə ac bir insan
Elləri qurtardı ölüm yasından.
Gərək indən belə hər qozasından
Bir kilo toplansın azı pambığın.

* * *

Ayrı yer ayrılır qoyuna, mala
Gəlinlər bəzənir qumaşa, ala.
Qarılar, qocalar baxmayır fala
Dolur dəstə-dəstə düzü pambığın.

* * *

Dağlara gün doğur, xoş ruzgar gəlir
Düşmənin başına dünya dar gəlir.
Kəndə qalaq-qalaq kitablar gəlir
Çəkilir hər yerdə sözü pambığın.

* * *

Çağırdım yarışa Özbəkistanı
Dedim qüdrətimi yaxından tanı.
Mənə üstün gələn bir oğul hanı?
Çünki ağ yaranıb üzü pambığın.

* * *

Mehriban yaranıb o dosta, yara
And içib, əhd edib bizim ilqara.
Gedir nümayəndə qurultaylara
Söz alıb danışır özü pambığın".

* * *

Mənim qəhrəmanım oxuyur bunu
Bir yeni dünyanın doğulduğunu.
Başqa bir vüqarla çatılır qaşı,
Əsrinin Neronu Hitlerə qarşı.
And içir Leninin adına əlan
Yadlar ayağını tərpətsə bir an
Bizim bu bəxtiyar ellərə sarı,
Alacaq Qafqazın mərd oğulları,
Bütün cəbhələri aslanlar kimi,
Dönüb partlayacaq vulkanlar kimi.
O xain Neronun məğrur başında.
Ömrünün bəxtiyar və gənc yaşında
O vaxt qəhrəmanım, indidən tanı
Olacaq ordunun baş komandanı.
Qalxacaq yenə də ərəb atına,
Sürüb səs salacaq yerin altına.
Düşmənin başına od yağdıracaq
O da öldürəcək, o da qıracaq.
Qəhrəmanım yeni, şöhrəti yeni
Döşündə Leninin qızıl ordeni.

* * *

Gecə can üstündə, açılır səhər
Ayılır yuxudan, əsnəyir şəhər.
Artıq görünməyir nə ulduz, nə ay
Bir yeni sürətlə qaçır tramvay.
Qoşur iş başına sağlam ürəklər
Oxşayır səhəri sakit küləklər.
Odur bax, azacıq dənizdən kənar
Göylərə baş vuran işlək buruqlar.
Bir yeni qüvvətlə soxulmuş yenə
Bu sarı torpağın dərinliyinə.
Baxır qəhrəmanım onlara sarı
Sevərək seyr edir o buruqları.
Parlayır alnında əzəmət, vüqar
Üfüqdə at kimi çapır buludlar.
Gülür təbiətin o göyçək qızı
Üfüqlər qırmızı, göylər qırmızı.
Qırmızı bir cahan əməlimizdir
İşığı yandıran öz əlimizdir...
Uğurlar sənə ey qoca kainat.
Yaşasın gələcək! Yaşasın həyat!

* * *

Tarix! Bu ixtiyar gəncliyinlə sən
Mənim sözlərimin ilk şahidisən.
Dünya dəyişəcək atlas donunu
Əzəldən qaydadır bilirəm bunu.
İnsanlar gələcək, gedəcək bir-bir
Sular məcrasını dəyişəcəkdir.
Özgə rəng alacaq çiçəklər, otlar
Yaracaq göyləri uçqun buludlar.
Düşəcək sulara ay da, ulduz da
Baxıb seyr edəcək oğlan da, qız da.
Açacaq sirrini bahar da, qış da
Mehriban yağacaq qar da, yağış da.

Ruha küsməyəcək nə gül, nə yarpaq
Sifariş verəcək günəşə torpaq...
Dodaqlarda gülüş, qollarda qüvvət
Qardaş olacaqdır bizə təbiət.
O vaxt qoyulacaq qılınclar qına
İnsanlar güləcək çocuq ağlına...
Mənim də sevdiyim bu əziz vətən
İlhamlar alacaq gələcəyindən.
Açacaq ağzını qalın kitablar
Bu ölməz insanlar, bu inqilablar,
Bir-bir görünəcək gözlərimizə
Salamlar verəcək gələcək bizə.
Elçilər gələcək Misirdən, Şamdan,
Günəşli gündüzdən, aylı axşamdan.
Daşacaq Bakıda insanın sayı
Şuralar Şərqinin ilk qurultayı.
Burda başlanacaq! O gün ixtiyar
Bir mədən işçisi alnında vüqar
Başının üstündə bir qızıl bayraq
Türkcə salam verib iclas açacaq.
Ömrü az olsa da bu dastanımın
O gün, bilirəm ki, qəhrəmanımın
Burda yüksələcək bir tunc heykəli
Şərqi göstərəcək uzanan əli.

*1935, aprel*

## TORPAĞIN TƏLƏBİ

Şairim! Qələmi götür də dinlə,
Bir yeni dastan yaz öz əllərinlə!
Dünyanın qoca bir şahidiyəm mən,
Örtülü qız kimi qaçıb gizlənən,
Dilsiz əsrləri yarıb keçmişəm,
Günəşdən payımı mən də içmişəm.

* * *

Başım dəfələrlə düşdü qorxuya,
Gözlərim getmədi şirin yuxuya.
Döyüşlər səslənir qulaqlarımda...
Mənim durna gözlü bulaqlarımda,
Qanlı süngüsünü yudu çoxları.
Başımın üstündə düşmən oxları,
Fırlana-fırlana sancıldı yerə,
Xələtlər payladım hər cahangirə.

* * *

Yaşıma dolduqca qanlara doydum,
Hər daşın altında bir oğul qoydum.
Ah... o qılıncları, o qalxanları
Sinəmin üstündən axan qanları
Nəsildən-nəsilə verdim yadigar
Üstü zər yazılı bir keçmişim var!
Üstümə hər gələn bac aldı keçdi.
Yaşım döyüşlərdə qocaldı keçdi
Eşitsin nəslimiz məndə nələr var,
Məndə həqiqətlər, əfsanələr var!

*1935*

## KİSLOVODSK

Göylər pərisini görmək əməli
Gözümdə qalmışdı çocuqluğumdan...
Tanış olmadığım dağlar gözəli
Pərişan yuxuma girdiyi zaman
Bir gecə, bir yuxu, bir də ikimiz
And içib, söz verdik gələcəyə biz!

Bu torpaq da bilir, bu göy də bilir –
Əzəldən aşiqəm mən gözəlliyə.
Saçlarım ağarır, gücüm əskilir
Günlərim boş yerə keçməsin deyə;
Açılsın qarşımda hər dağ, hər dərə,
Qələm çalmalıyam gözəlliklərə!

Ey günəş! Ey bulud! Ey əski dostlar!
Adınız gələndə titrəyir dilim.
Mənim təbiətə bir səfərim var,
Səsimə səs versin doğma sevgilim!
Bu tənha gecənin qoynunda barı
Xəyalım seyr etsin ağ buludları.

Dayanmış yanaşı yaşıl təpələr,
Durur hər qapıda boylu bir çinar;
Günəş yana – yana, yağış səpələr,
Xilqətin nə böyük bir calalı var!
Axır qıjıltıyla köpüklü çaylar
Düşür qucağına ulduzlar, aylar.

Başını yastığa qoyanda insan,
Günəş kəhər ata minənə qədər
Axır damarlarda şırıl-şırıl qan;
Ətirlər içində oyanır səhər.
Budur mən dediyim dünya gözəli!
Onu bəzəmişdir xilqətin əli.

Böyük bir ölkənin hər bucağından
Tatar da, gürcü də, türk də, çeçen də
Ayrılıb gəlmişdir öz ocağından.
Burda müsafir də, yoldan keçən də,
Durur bu lövhənin qarşısında şən,
Qarışır bir yerə deyib gülüşən.

Budur bax, qarşımda Hava xramı,
Günəşin altında çılpaq omuzlar*,
Dağların döşünə sərilmiş hamı,
Söz atır oğlanlar, gülüşür qızlar.

Günəş gizlənməkdə, üfüq qırmızı –
Elə bil donmuşdur buludlarda qan.
Ruha tanış gələn Qaraçay qızı
Şahin vüqarilə keçir yanımdan.

Hörüklü saçları iki qatardır,
Durna baxışları dəniz kimi lal;
Qanımda, qəlbimdə bir axın vardır,
Mənə tanış gəlir üzündəki xal...

Mən "dayan!" deyirəm, o deyir "sürət!"
Dinib danışmayır canlı bir insan;
Bu bəlkə əskidən qalma bir adət,
Bəlkə də qısqanır nişanlısından?

Dağların döşündə cərgələnərək,
Durmuş ordu kimi şam ağacları;
Dumanlar, çiskinlər dağdan enərək
Yürüyür şəhərin üstünə sarı.

Birdən şimşək çaxır, göy guruldayır,
Qışqırır qocalar, ömrü yarılar;
Qayalar dil açıb bərk uğuldayır.
Günlüyün altına dolur qarılar.

---

* Çiyin

O yanda bir dağ ki, dörd yanı dərə,
Onun zirvəsində çadır durur tək.
Çıxıram döşlərə moş* dərə-dərə,
Çadırı oynadır əlində külək.

Baxıram heyrətlə "Qırmızı daşa",
Üstündə Leninin heykəli vardır.
Könül salam verir yara, yoldaşa,
Duyub yaşayanlar nə bəxtiyardır!

Sakit dərələrə səs sala-sala
Açıq pəncərəli qatarlar gedir.
Müsafir yolçular boylanır yola,
Dağlar gözəlini ziyarət edir.

Hər daşın dibində qaynayır narzan,
Köpürüb ağarır qabarcıqları.
Ən uzaq ellərə xəbər aparsan,
Karvanlar axışar bu yerə sarı.

Unudub bir zaman ellərimizi,
Burda nəfəs alıb dincəlirik biz;
Təbiblər narzanda çimdirir bizi,
Bərkiyir boşalmış sinirlərimiz.

Yarın səfəri var bu insanların,
Baxışlarda həyat, qollarda qüvvət...
Burda təmizləşən qara qanların
Gücilə yaranır həyat və sənət!

Göylər pərisini görmək əməli
Gözümdə qalmışdı çocuqluğumdan...
Tanış olmadığım dağlar gözəli
Pərişan yuxuma girdiyi zaman
Bir gecə, bir yuxu, bir də ikimiz
And içib, söz verdik gələcəyə biz...

*1935, avqust*

---
* Meyvə adıdır.

## ALQIŞ

Girib Şah dağının qoynuna sarı
Getdikcə gözlərdən uzaqlaşdınız;
Qartallı Qafqazın mərd oğulları,
O qarlı dağları asan aşdınız.

O boz dumanlarda qanad salır quş,
Soyuqdan od kimi qızarır üzlər.
Deyirlər sizə bir əyləncə olmuş
Yuxusuz gecələr, yorğun gündüzlər.

O dar keçidlərin qucağında siz
Çaldınız ilk dəfə "Budyonnu marşı".
Dildə dastan olan tunc iradəniz
Nələr vəd eylədi düşmənə qarşı?!

Qatır dırnaq salan qayalıqları
Bir yeni qüdrətlə yarıb keçdiniz.
Əridi hirsindən dağların qarı,
Bulaqlar başında yeyib içdiniz.

Dönüb qaçmadınız borandan, qardan
Var olsun qəhrəman böyüdən ana!
Gəlir sorağınız manevralardan,
Alqış ananıza – Azərbaycana!

*1935*

## TƏRANƏ

Sevgilim, insanın ömrü gödəkdir,
Ömür bir quş kimi uçacaq əldən.
Bizə də belə bir gün gələcəkdir,
Dünya bu hökmünü vermiş əzəldən.

Gəl duraq yanaşı, xəyala varaq,
Bizə layla desin suların səsi;
Dünyadan xoş keçən bir gün aparaq,
Qazancdır gəncliyin hər xoş nəğməsi.

Atıl cəbhələrdən, keç cəbhələrdən
Ömrünün bu əziz, bu gənc yaşında.
Mənim anam kimi gəl oturma sən
Gecələr ağlayan beşik başında.

Gözəldir avazın, xoşdur nəfəsin
Coşub, tribunadan danışanda sən;
Döyünən ürəyin, gurlayan səsin
Bizə xəbər versin qərinələrdən...

Sevgilim, könlümdən keçənlərə bax:
Gəl salama çıxaq ellərimizə!
Dastanlar yaradaq, dastanlar yazaq,
Gələcək duyğusuz deməsin bizə...

*1935, 13 oktyabr*

## NATƏVAN

*“Varımdı sinədə dərdü qəmi-nəhan, ölürəm*
*Fəda olum sənə, gəl eylə imtəhan, ölürəm!”*

***Xurşudbanu Natəvan***

Üzündə son bahar, ağzında yaşmaq,
Sənin gözəlliyin solğun görünür.
Gəl yaxın əyləşək, yaxın danışaq,
Mənalı gözlərin dolğun görünür...

Söylə, şeirlərin can verir nədən?
Ağlayır dediyin dərdli qəzəllər.
Bir çiçək qopardı hər gəlib gedən,
Sənin də payına düşdü xəzəllər...

Baxıb qərənfilin solğun rənginə,
O şəhla gözlərin incilər tökdü.
Bir qadın ruhunun dərinliyinə
Hər axşam yeni bir qaranlıq çökdü.

Əzəldən belədir eşqü-məhəbbət,
Səni də ağladan sevdamı, nədir?
Dərdin tarixlərin dərdidir, əvət!
Hicran göz yaşına bir bəhanədir...

Aşanda dağları çarın ordusu,
İncidin dünyadan, küsdün vətəndən.
Bir söylə, şairim! Nə sirdir bu –
Könüllər ayrıla bilməyir səndən.

Həyata ilk dəfə açıldı gözün
Tarixin doğduğu o qara gündə.
Oğlunun, qızının dönük ömürü
Keçdi ayrılıqda, keçdi sürgündə...

Sən söhbət açanda meydən, məzədən
O murdar ağzını büzdü şəriət...
Dönüb qövr elədi yaran təzədən,
Bir zindan kəsildi sənə təbiət.

O qəlbə, ilhama sığındıqca sən
Qaldırdın qədrini şerin, sənətin.
Sən bizim tarixə hədiyyəsisən
Əziz bir torpağın, bir məmləkətin.

Yırtıldı günəşin qara pərdəsi,
Qızlar qanad çalır ağ buludlara.
Gəzir dodaqlarda şerinin səsi,
Oyan! Saçlarını təzədən dara!

İndi nə örtü var, nə örtünən var,
Nə həyat insanın belində yükdür.
Dəyişmiş gördüyün aciz qadınlar,
Onların şərəfi, qədri böyükdür.

Üzündə son bahar, ağzında yaşmaq,
Sənin gözəlliyin solğun görünür.
Gəl yaxın əyləşək, yaxın danışaq,
Mənalı gözlərin dolğun görünür...

*1935*

# LEYLA

*İlk təyyarəçi qızımız Leylaya*

I

Bu ad şairlərə çoxdan tanışdır,
Bu adla çoxları tutulmuş dərdə...
Bəlkə deyiləcək söz qalmamışdır?
Doğdu Leylasını bizim günlər də...

Füzuli çataraq sıx qaşlarını,
Leylinin eşqinə saldı Məcnunu.
Axıtdı həsrətlə göz yaşlarını,
Bizə xəbər verir tarixlər bunu.

Sevişən iki qəlb, duyan iki qəlb
Döyünüb çırpındı daş qəfəslərdə...
Aşiqin dərdinə "eşq oldu səbəb",
Asıldı ortadan qara bir pərdə.

Məcnunun bəxtiyar və gənc yaşında
Axır qərargahı oldu biyaban.
Quşlar yuva saldı onun başında,
Leylinin gözündə bulandı ümman.

Sanma əfsanədir bu qəmli dastan!
Bunda günəş kimi bir həqiqət var...
Bunda məhəbbətlə ölən bir insan,
Bir könül, bir xəyal, bir də sənət var.

II

Kamal soyundurdu Leylanı çılpaq,
Çıxardı sahilə, ay işığına;
Baxdı dönə-dönə, həzzlər alaraq,
Açıq bir bədənin yaraşığına.

Yazıq ki, Leylanı tutan sətəlcəm
Qızcığın qanına işlədi birdən.
Həyatı tərk etdi o taleyi kəm,
Şair “ilham” aldı bu faciədən...

Baharın fəslində soldu bir çiçək,
Gözəl bir insanın boş qaldı yeri.
“Odalar ağladı inildəyərək”...
Matəm qaytarmamış öləni geri!

Nə mən Məcnun kimi çöllərdəyəm, bil,
Nə sən Leyli kimi hicran xəstəsi...
Bizim qismətimiz göz yaşı deyil,
Bizimdir yaşamaq, gülmək həvəsi.

Sən göylər yolçusu bir azad quşsan,
Aylı gecələrdə görürəm səni.
Zöhrə ulduzuna məftun olmuşsan, –
Sürürsən üstünə öz təyyarəni!

Bəzən bu səfərdə ağır dumanlar,
Gəlib quldur kimi kəsir yolunu,
Sənin qüdrətinə inanmayanlar
Tutur xəyalında qız olduğunu...

Bəzən də boşluğa rast gəlir yolun,
Narın bir sarılıq çökür rənginə,
Azacıq qüvvədən düşsə də qolun
Cəsarət yaşadır həyatı yenə!

Gəlir xəyalına: “Anam hardadır?”
Deyən bir körpənin dodaq büzməsi...
Anan yerdə deyil, buludlardadır,
Ona yetişməyir insanın səsi.

Sən ağ dumanları yarıb biçəndə
Sevinir elin də, gülür oban da;
Sən bizim dağların üstdən keçəndə
Dalır düşüncəyə çöldə çoban da.

Şöhrətin dolaşır meyli, məzəli
Elin xoş dilində, xoş avazında,
Bir gəl tanış olaq, ellər gözəli!
Aşıqlar adını çalır sazında...

Mən demədim sənə: "Ay ağzı püstə!"
Havadır oylağın, yerdir vətənin.
Dumanlar içindən, əli göz üstə
Qoca Şərq boylanır dalınca sənin...

*1935*

# TƏBRİZ GÖZƏLİNƏ

*Şairin bloknotundan*

Çox da fikir vermə danışıqlara,
Bilirəm, ürəyin mənə bağlıdır...
Nədir o başına örtdüyün qara?
Bizim ki, eşqimiz bir el nağlıdır...

Bilirəm, ən şirin röyalarda sən
Deyirsən: “Sevgilim gəlirmi ola?”
Xəyalım əyilir, öpür əlindən;
Güllü yaylığınla çıxırsan yola...

Nədir bu həsrətin adı, ünvanı?
Baisin evində işıq yanmasın!
Ah, Araz, ah, Araz, vədimiz hanı?
Bir ürək ikiyə parçalanmasın!..

Ayırdı bir vurğu əzəldən bizi...
Parladı şahların qan rəngli tacı,
Sıxlaşan bir duman aldı Təbrizi;
Fələk bəxtimizə baxdı qıyqacı...

Anan vərəmlədi yoxsul yuvada,
Soyuq bir məzarı əlinlə qazdın;
Baban öküzüylə öldü tarlada,
Bütün bir tarixi sinənə yazdın...

Mən də bu yolları keçmişəm, sonam!
Mənim də ən dərdli bir keçmişim var.
Təbibsiz, davasız can verdi anam,
Yaslı köynəyini geyindi dağlar.

Demək ki, dərdimiz-sərimiz birdir,
Həyatın qızıdır məhəbbətimiz...
Gəl duraq diz-dizə, günləri bir-bir
Sayıb, hesablayaq yaşımızı biz.

Axşam sularının zümzüməsidir,
Mənim telli sazım, səninsə tarın;
Yazıq bir ananın hicran səsidir
Mənim zil şikəstəm, sənin qatarın.

Olub keçənlərə gəl qələm çəkək,
Dünən bu gün üçün bir yadigardır
Bilirəm, sevgilim, bilirəm gerçək,
Sizdə qış günüdür, bizdə bahardır...

Odur, bax o qıza, bax o gəlinə,
Baxdıqca qaynayır insanın qanı;
Azadlıq bayrağın alıb əlinə,
Günəş salamlayır Azərbaycanı.

Bir yeni rəng alır Mil də, Muğan da
Bu bayram günündə, bayram ilində.
Alim də, şair də, dağda çoban da
Deyir mahnısını ana dilində.

Gülür dodaqlarda yeni bir zəfər,
Zəfərdən-zəfərə qüvvət alalı.
Güdür gözü kimi hər qızıl əsgər
Qanla qazanılan bir istiqlalı.

Sevənlər az deyil bizim Vətəni,
Günəşə gözlərim açıq gedirəm.
Böyük bir ölkənin adından səni
Bu bayram gününə dəvət edirəm.

Gözlərin dolmasın!.. Dayan bir az da!
Qəlbin də, sevgin də, dərdin də haqdır...
Azadlıq bayrağı güllü bir yazda
Təbrizin üstündə parlayacaqdır!

O bayram gününə inanıram mən,
Araz yol verəcək üstündən bizə.
Pioner oğlumun tutub əlindən,
Qonaq gələcəyəm qoca Təbrizə!

*1935, 13 dekabr*

## ANAM GƏLİNİ

Başına döndüyüm, anam gəlini
Sən ilk qönçəsisən bizim gülşənin.
Hər səhər günəşə uzat əlini,
İşıqda, qüvvətdə adın var sənin,
Sən ilk qönçəsisən bizim gülşənin.

Öpsün ayağını çöldə çiçəklər,
Quşların avazı bir toya dönsün.
Tökülsün sinənə qara birçəklər,
Gözəllik dünyada açıq görünsün,
Quşların avazı bir toya dönsün.

Sən ilk pərisisən şerin, sənətin,
Adın tarixlərdə bir yadigardır.
Günəşdən rəng alan bir məhəbbətin
O açıq alnında işığı vardır,
Adın tarixlərdə bir yadigardır.

Hüsnünü örtməsin nə pərdə, nə rəng,
Ay kimi saf dolan, gün kimi açıq,
Keçmişin üstünə qələm çəkərək,
Vuruş meydanında vuruşmağa çıx,
Ay kimi saf dolan, gün kimi açıq.

Könlümdə sirri var, tərlan sonamın
Bütün gözəlliyin gözüdür insan,
Zülmətdə şam kimi sönən anamın
Ölüm qisasını alaq dünyadan
Bütün gözəlliyin gözüdür insan.

Beşikdən başlamış ölümə qədər
Tarixlər yazılır sənin əlinlə
Səndədir yaraşıq, səndədir hünər
Şerim qanad çalır hər əməlinlə
Tarixlər yazılır sənin əlinlə.

Başına döndüyüm, anam gəlini,
Sən ilk qönçəsisən bizim gülşənin,
Hər səhər günəşə uzat əlini
İşıqda, qüvvətdə adın var sənin,
Sən ilk qönçəsisən bizim gülşənin.

*1936, 7 fevral*

## SƏNƏT USTASINA

Mən onu ilk dəfə gördüyüm zaman
Sıxdım məhəbbətlə titrək əlini;
Oxudum mənalı baxışlarından
Xəyalın, sənətin tunc heykəlini.

* * *

Qəlbi də, fikri də gün kimi aydın,
Onda təbiətin mənası vardı.
Ey sənət ustası! Sən olmasaydın
Günəş ilhamıma soyuq baxardı.

* * *

Ey hava dalğası, ağzını bir yum!
Dayanın, car çəkən başsız küləklər!
A dostlar, su verin mənə bir udum,
Sinəmi yandırdı bu acı xəbər.

* * *

Bizim Maksimi də cərgədən aldı
Yenirkən ölümün qara pəncəsi.
Sanma ki, şam kimi sönüb qaraldı,
Əsrlər boyunca o sənət səsi
Çalacaq təblini göy dalğalarda,
Çiçəklər solmayır bizim baharda...
Ayağa qalxsın da bu dağ, bu dərə,
Buludlar sallasın öz yaylığını;
O sənət dostuna – böyük rəhbərə
Yetirin şairin baş sağlığını...

*1936*

## SÖZ BUKETİ

*May şənliyinə*

Dinləyin! Dinləyin! Danışır səhər!
Səhərin yeni bir sözü var bizə;
Ətirlər içində oyanır şəhər,
Günəş buket verir əllərimizə.
Rəngin* şəfəqlərə boyanır Xəzər.
Uçur qağayılar – o nazlı quşlar.
Axşamdan oynaşan şıltaq ləpələr
Gecənin sonunda sakit olmuşlar.
Qayıqlar, gəmilər üzür yanaşı,
Sallanan bayraqlar əks edir suya;
Könül salamlayır yarı, yoldaşı,
Dalğalar yol verir bizim orduya.
Hər kiçik qayıqda bir qarmon səsi,
Baxır martılara**, rəqs edir qızlar.
Ötür Qarabağın zil şikəstəsi,
Heyrət içindədir açıq ağızlar,
Əl vurub oynayan, çalıb çağıran;
May günü toy düşür bizim dənizə.
Bu dolğun baharı duyan hər insan
Əlində zənbili qoşulur bizə.
Şəhərdən kənarda ılıqdır hava,
Orda yolumuzu gözləyir çöllər...
Oğlan qaça-qaça, qız qova-qova,
Bir deyib, bir gülür obalar, ellər.
Hər ağac altında bir ayrı dəstə,
Hər qaya dibində bir süfrə vardır;
Bir həyat duyuram hər incə səsdə.
Bizim gəncliyimiz nə bəxtiyardır!

İxtiyar nənəm də çöldədir bu gün,
O da qarşılayır bizim baharı;

---

* Müxtəlif çalarlı
** Qağayılar

Gözündə kainat başqadır bütün,
Gəncliyə şadlanır ağbirçək qarı.
Geyimlər dümağdır başdan-ayağa,
Döşlərdə ağ çiçək, əllərdə lalə.
Səsimdən təbiət qalxır ayağa,
Göydə qaraquş da dalır xəyala.
Düşüncələr yeni, duyğular yeni,
Dəyişmiş dünyanın söhbəti, sazı.
Döşündə Leninin qızıl ordeni
Oturmuş ixtiyar buruq ustası.
Nəvəsi tar çalır, qızı oxuyur,
Süfrədə paxlava, göyərti, qaymaq;
Təbiət otlardan xalı toxuyur.
Qaranquş şığıyır qanadlanaraq.
Vurur qəlbimizdə dünyanın qəlbi,
Üzlərdə qalmamış sarılıqdan iz.
İçirik günəşi bir badə kimi
Yaradan ellərin sağlığına biz.
Günəş yuvarlanır dağlar dalına,
Qaralır çöllərin gəzinti yeri;
Baxaraq göylərin seyrək xalına,
Dolğun nəşələrlə dönərək geri.
Əlvan çıraqlarla Bakı Soveti
Bizi qarşılayır, sevinir axşam.
Günəşdən ayrılan bir qüvvət kimi,
Dünyanın qəlbinə süzülüb axsam!..

*1936, 1 may*

## SÜNBÜL

Sünbülüm, sünbülüm, sarı sünbülüm,
Adına söz qoşum barı sünbülüm.
Ellər həsrətidir bu əmri verən;
Şirin gecələrdə yuxuma girən
Yaşıl tarlamızın mənzərəsidir,
Xırman üstündəki ana səsidir.
Əzəldən ruhuma doğmadır bu səs,
Bir qüvvə varmıdır bu səsə əvəz?

Deyirlər dünyadan qocadır yaşın,
Qüvvətdən quruldu torpağın, daşın.
Deyirlər səndədir xeyir, bərəkət,
Deyirlər səndədir həyat, hərəkət.
Mən bunu qəlbimlə çoxdan anladım,
Bəzən gülüşlərə tutuldu adım...
Dedilər arxamca: "El şairidir,
Külüng şairidir, bel şairidir,
Yoxdur sənətində qanadlı sözlər...
Boyalı dodaqlar, sürməli gözlər.
Yoxdur söhbətində uçan mələklər,
Tərif olunmayır göydə fələklər,
Şairin yeridir yalnız buludlar,
Vurğunda nə könül, nə də xəyal var."
Gərdim bu sözlərə polad sinəmi,
Ellərin nəşəsi, ellərin qəmi
Sinəmin üstündən aşdı sel kimi,
Tənələr yanımdan keçdi yel kimi.
Sən gözəl kəndimiz! Sən ilk sevgilim!
Səni son nəfəsdə deyəcək dilim!
Sünbülüm, sünbülüm, sarı sünbülüm!
Könlümün qonağı, yarı sünbülüm!
Sən ilk bəzəyisən bizim Vətənin,
Əski kitablarda adın var sənin.
Qarşıdan al geyib gələndə bahar,
Bilirəm qəlbində nə işvələr var!

Yanından süzülüb keçəndə külək,
Titrəyir səndəki zərif bir ürək.
Coşub dəniz kimi dalğalanırsan,
Deyirlər o zaman məni anırsan!
"Məhəbbət cüt olar" bu, bir məsəldir,
Dünyanın şöhrəti yaradan əldir...
İpək saçlarını dara sünbülüm!
Ərməğan göndərək yara sünbülüm!

Bu qoca dünyada nələr var, nələr,
Günəşin altında yanan dəmyələr
Bizə daş əsrindən bir yadigardır,
Yerin sinəsində yanğılar vardır...
Bəzən bahar kimi xoş gələndə qış,
Azca səpələyib ötəndə yağış,
Susuz maral kimi yanar dəmyələr,
Əfilər oynaşar, ilanlar mələr.
Düşər sinəsinə kəndlinin başı,
Axar sərin-sərin gözünün yaşı,
Bükülmüş belində paslı bir oraq...
"Vay" deyib dizini yumruqlayaraq,
Evdə uşaqları salır yadına,
Göylər yetişməyir onun dadına.
Bu acı günlərin şahidiyəm mən,
Gözümlə görmüşəm körpəliyimdən.
Eşit sözlərimi cansız təbiət!
Vicdansız, duyğusuz, qansız təbiət!
Yenə quduz kimi çıxma yolundun,
Vulkanlar çəkinir insan oğlundan.
Onun sənəti var, onun gücü var,
Onun ağıl adlı bir ər gücü var.
Dilsiz qayaları döşündən dəlir,
Dağlar qarşısında salama gəlir.
Dünyadan söz açır, danışır bir-bir,
Uzaq əsrlərdən xəbərlər verir.
Ağıl işıq salır gözlərimizə,
Hər gün yaxınlaşır gələcək bizə...

Dərin dəryaların tapır sirrini,
Dünyanın ən böyük cahangirini,
Ağıldır torpağa döndərən "fələk",
Ağılsız insanlar sürünsün gərək,
Təbiət! Ən böyük qüvvən bizdədir.
Çayların cilovu əlimizdədir,
Artıq oynamırıq boranla, qarla,
Dəmyəmiz su əmir tulumbalarla.
Arazın boynuna kəmənd atırıq.
Hər suyun gözündə bir bənd çatırıq.
Oğul təbiətə sinə gərərək,
"Təvəkkül Allaha" deməsin gərək,

Sünbülüm, sünbülüm, sarı sünbülüm!
Sənmisən çiçəyim, sənmisən gülüm?
Bürkü gətirməsin sənə buludlar
Üstünə qonmasın quşlarla, qurdlar.
İnsanlar çoxalır bizim Vətəndə.
Bütün bir ölkənin gözü var səndə.
Gözdən oğurlanan bir dənin belə,
Köməkdir insana, köməkdir elə.
Qaldırsın başını göylərə sarı,
Ellik xırmanında dərz tayaları.
Baxdıqca düşmənin gözü qaralsın,
Sənin özün kimi, üzü saralsın...

Vətən torpağının qızı, gəlini,
Yadlara açmasın təmiz əlini.
Bunlar vicdanıma toxunar mənim,
Gözümdə ildırım oxunar mənim!
Sinənə düşməsin yara, sünbülüm!
Günlərin keçməsin qara, sünbülüm!
Tarixə bir daha gözünü gəzdir,
Bəşərin ilk dərdi çörək dərdidir.
Uçub dağılardı sənsiz dörd yanım,
Hər qızıl əsgərim, hər komandanım.

Doğrulda bilməzdi öz nişanını,
Qardaşlar qanını, dostlar qanını.
Düşmən qaldırardı öz bakalında
Dənizlər dalında... Dağlar dalında...
Sünbülüm, sünbülüm, sarı sünbülüm,
Sənmisən çiçəyim, sənmisən gülüm?
İki düşmənim var dünyada inan –
Birinci faşistdir, ikinci siçan!

*1936, 14 mart*

## YADIMA DÜŞDÜ

Başına döndüyüm gül üzlü sona!
Ömrümün ilk çağı yadıma düşdü.
Şairlər vətəni bizim tərəflər,
Tərlanın oylağı yadıma düşdü.

Oxuyun qəlbimi dastan içində,
Ürək döyünməzmi astan içində?
Payızın fəslində bostan içində
Şamamanın tağı yadıma düşdü.

Töküldü kağıza sinəmin sözü,
O ana yurdumun ocağı, közü,
Ceyranın duruşu, durnanın gözü
Kəkliyin ayağı yadıma düşdü.

Hanı at sürdüyüm boranda, qarda?
Gəzdim aşıq kimi minbir diyarda;
Gülüb oynadığım toyda, mağarda,
Qızların qolbağı yadıma düşdü.

Göylərə baş çəkir Göyəzən dağı,
Axşam açıq olur ayın qabağı;
Bizim gəlinlərin bayram qabağı,
Fəsəli yaymağı yadıma düşdü.

Sən bizim ellərin ruhuna bir bax!
Bizdən inciməmiş bir əziz qonaq.
Nişanlı qızların görüşdən qabaq,
Telini saymağı yadıma düşdü.

Vurğunun xəyalı gəzdi aranı,
Gözümdə oynadı dağın boranı;
Qışın buz qatığı, yayın ayranı,
Payızın qaymağı yadıma düşdü.

*1936, may*

## AZAD İLHAM

Ey azad ilhamım, gülər üzünlə
Səhərin rəngini seyrə dalanda,
Bütün kainatı gəzdir özünlə
Kiçik bir zərrədən ilham alanda!..
Doğra buludların bağrını qat-qat!

Kim deyir gecələr bizə qəfəsdir?
Daima qısqanan ürkək bir həyat,
Məncə, bu dünyada bir quru səsdir!
Sən, azad ilhamım, baş götürüb gəz,
Əngin üfüqlərə şığıyıb, yol al!
Əzəldən belədir: geriyə dönməz
Atılan bir güllə, uçan bir xəyal.
İnsan, deyirlər ki, çiy süd əməndir...
Utansın dünyada qədir bilməyən!
Mənim ki, oylağım göydür, çəməndir.
Gəlməsin yanıma deyib gülməyən!
Sən, azad ilhamım, nə bəxtiyarsan!
Taleyim, hünərim güvənir sənə.
Nə qədər dünyada varamsa, varsan,
Ömür çox görməsin bu haqqı mənə!

Nəsimi zahidlə durdu üz-üzə,
Söylədi: haqq adlı bir divan quraq;
Atdı pəncəsini gecə gündüzə,
Boğdu həqiqəti sadə fırıldaq...
Zahidin barmağın kəssəniz əgər,
Tanrı dediyinə arxa döndərər...
Bu miskin aşiqə baxın da bir az,
Diri soyulsa da dözər, ağrımaz.
Sən ey ülkərimiz, sönməz sənətkar!
Əsrlər boyunu gördü gözlərin;
Tarixlər boyunca qaldı yadigar
Ölməz fikirlərin, ölməz sözlərin!..

Füzuli doymadı göz yaşlarından,
Açdı qapısını səhər yelləri.
İncidi ən yaxın sirdaşlarından,
Ağlayıb, ağlatdı bizim elləri;
Ağarmış saçında, saqqalında qış...
Asiman dolandı şikayətindən,
Karvanı dərd adlı səhrada qalmış
Leylinin, Məcnunun hekayətindən.
Gətir xatirinə Vaqifi bu dəm.
Qırıldı qəlbində bir yurdun sazı...
Ağladı ardınca gözlərində nəm
Uçan durnaların küskün avazı.
Gərdi sinəsini o, fars dilinə,
Haykırdı türk dili, türk şeri gərək!
Bir yeni can verdi doğma elinə,
Üfüqdən üfüqə qanad gərərək...
Yazıq! Nəğməkarın ürək nəğməsi
Dəydi şüşə kimi, daş ürəklərə,
Böyük bir insanın boğuldu səsi,
Ahını əks etdi min dağ, min dərə.
Sən ey şerimizin, ana şairi!
O tərlan xəyallı, sona şairi!
Mən səni duyduqca qəmlər yeyirəm,
Sonra öz-özümə dönüb deyirəm:
Ey azad ilhamım, nə bəxtiyarsan!
Taleyim, hünərim güvənir sənə!
Nə qədər dünyada varamsa, varsan.
Ömür çox görməsin bu haqqı mənə!

Başımın üstündə nə yumruq durur,
Nə hicran səsi var mənim sazımda;
Nə qanun qoluma qandallar vurur,
Nə göylər darıxır xoş avazımda.
Budur, bax, qəlbimin axar qanını
İçirdim sənətə, dedilər: “Var ol!”
O böyük Leninin al nişanını
Taxdı yaxasına şair-komsomol.

Sən, azad ilhamım, o gündən bəri,
Qarlı buludların üstdən aşırsan.
Uçan durnalarla gəzib göyləri,
Onlarla səs-səsə qaqqıldaşırsan.
Səninlə çıxmışam ağ günə, inan!
Adını laylada desin analar;
Bir səs qulağıma gəlir hər zaman:
Sənin dostun da var, düşmənin də var.
İldırım baxışlı gözlərinlə süz
Həyatda milçəkdən fil yapanları!..
Odlu kəlmələrin atəşinə düz
Ağızdan qurd kimi söz qapanları.
Hər sözü-söhbəti başından yekə
"Alim" adamların gözünə düz bax!
Namuslu oğlunu sevən bir ölkə
Gələcək günlərdən utanmayacaq!..
Qamçıla, üzünün rəngi bozarmış
O çirkin keçmişin son "vüqarını",
Sən onun üstündə boranlı bir qış
Gücilə şaqqıldat qanadlarını.
Qamçıla, gündə bir cildə bürünən,
Onluq marıtlayan qara tuzları...
Bizimlə getməyən, fəqət sürünən
Vəzifə düşkünü o dəyyusları!
Budur, dövrəmizdə daima "heyhat!" –
Deyib bu dünyadan keçənlər də var.
Meyxana küncündə səadət, həyat
Eşqinə on gecə içənlər də var.
Elin tərəfindən, xalqın adından
Simsiz taxtaları çalandan danış!
Söhbəti işvədən, meydən, qadından,
Özgənin fikrini çalandan danış!
Sən azad ilhamım, məni danla ki:
"Şairim, hünərin, sənətin hanı?"
Sən də birdəfəlik bunu anla ki:
"Mənim düşmanımdır elin düşmanı!"
Sən azad ilhamım, baş götürüb gəz!

Əngin üfüqlərə şığıyıb, yol al!
Əzəldən belədir: geriyə dönməz
Atılan bir güllə, uçan bir xəyal.

Ey günəş, ey bulud, girin qoynuma!
Bu saf təbiətə mehribanam mən;
Sevgilim, qolunu dola boynuma,
Kəlmələr od kimi düşsün dilimdən.
Kaman qaşlarını çatma, günəşim,
Min sızıltı qopar dost ürəyindən!
Dərin dəryalara batma, günəşim,
Əzəldən düşmanam qaranlığa mən!..
Məqsədim olmamış bir parça çörək,
Mənim sənətim var, alın tərim var.
Bayronu yarışa çağıram gərək,
Sinəmdə ağ qalan bir dəftərim var.
Bəşərdir torpağın, göyün təməli,
Bəşərsiz günəş də yerə alçalır.
Könüldür sənətin ölməz əməli,
Hər simin üstündə bir aləm çalır.
Mən ki, qaranlıqdan, qəfəsdən uzaq
Könüllər yolçusu azad bir quşam.
Sən ey kinlibaxış, tənəni burax,
Mən öz zəhmətimlə azad olmuşam!
Mən ki, əllərimi dünyadan üzüb,
Demədim: “Bir sıfır yazılsın adım”,
Çayl Harold kimi insandan küsüb,
Vətən torpağilə vidalaşmadım.
Kim keçər bu yerin daşından, deyin?!
Vətəndən ayrılar hansı şərəfsiz?
A dostlar, günəşdən bir paltar geyin,
Könül xallar vurur bəzənəndə siz!
Ey bizim çəmənin sirdaşı quşlar,
Çiçəkdən çiçəyə uçuşun siz də!
Saatlar, əsrlər azad olmuşlar
Bizim bu sosialist Vətənimizdə!
Ey çaylar üstündə süzən sonalar,

Daşlara dəyməsin bir tükünüz də!
Siz ey yeddisini doğan analar,
Cəbhədə bir durur oğlan da, qız da!
Siz ey bağçalarda yatan uşaqlar,
Səadət tökülür xoş üzünüzdən!
Sizinlə şənlənir bağçalar, bağlar,
Analar zövq alır gülüşünüzdən.
Ətir saç aləmə, sən ey qönçə gül!
Öpüb yarpağını, dənləyim bir-bir;
Səhər nəğməsini bağçada bülbül
Mənim nəfəsimdən, məndən öyrənir.
Sən ey bu torpağın qızı, gəlini,
Utanma gül açan yanaqlarından!
Hər səhər günəşə uzat əlini,
Qüvvət əm günəşin dodaqlarından!
Sən ey şehli səhər, ey sakit axşam!
Qəlbi düşündürən hansı səbəbdir?
Fəzaya gün kimi, ay kimi axsam,
Torpaq inciməsin... Bu bir tələbdir...
Ey ana torpağı, gözlərin aydın!
Uzaqda səslənir indi zülümlər...
Ağ günlü bayrağım, sən olmasaydın,
Açardı qapımı vaxtsız ölümlər.
Silahlı qardaşım, sərhəd boyunca,
Alıcı gözlərin qızılquş olsun!
Oxşasın boyunu anam doyunca,
Dünyanın son adı qurtuluş olsun!

*1936, 2 avqust*

# SƏMİMİYYƏT YOLÇUSU

I

Şairim, çaldığın bu telli sazdan,
Günəşli gündüzdən, çiçəkli yazdan
Könül xumarlandı ay dönə-dönə,
Qəlbin vurğusunu say dönə-dönə.

Doğrudur, saqqalın, saçın ağarmış,
Ruhuna girməmiş qurd ağızlı qış...
Şaxtaya düşməmiş bir ilk baharsan,
Döyüşdə, cəbhədə hər zaman varsan.
Bu varlıq yaşadır əzəldən bizi,
Bu varlıq yaşadır gənc nəslimizi.
Çəkilsin dağların başından duman,
Ölümdən, heçlikdən səadət uman
İnsanlar dünyadan görüm yox olsun,
Sönük vicdanları yerə soxulsun!

Utansın günəşin rəngindən bir az
Axşam qaranlığı bəstələyən saz.
Söylə, xəyanətə dözərmi vicdan?!
Ağ günlər əsrini görən bir insan
Dönüb göz yaşından ilham alarmı?
Şer də, şair də heç qocalarmı?
Ətirlər dağılır xoş nəfəsindən,
Çiçəklər oyanır ayaq səsindən.
Varlığın, vicdanın ləkədən uzaq,
Böyüklə böyüksən, uşaqla uşaq;
Əsrə layiq olan bu ruhunla sən
Ölkəmin qoca bir müəllimisən!

"Mən də bir kişiyəm, varım-yoxum var,
Üç qızıl əsgərim – üç çocuğum var" –
Deyən bir atanı öpməliyik biz,
Onu sevməlidir, sevir nəslimiz!

II

Mənim də Yusifim səninkilərlə
Qoşub bir məqsədə, qoşub bir dilə,
Başında tutacaq bayrağımızı,
Düşmənlər istərsə torpağımızı,
Aslan kəsiləcək sular sonası,
Bunu laylasında deyir anası.

Şaiqim! Şairlər içində təksən,
Təmiz vicdanınla gülsən, ipəksən.
Dilindən küsməmiş tanış da, yar da,
Səndən inciməmiş qarıncalar da...
Keçdi qaranlıqda odlu gəncliyin,
Xoş olsun indiki qulaq dincliyin.

Günəş bir qüvvədir, yandıqca sönməz
Tarixin təkəri geriyə dönməz...
Əməlin qurtuluş, varlığın sənət,
Yaşasın qardaşlıq, bir də məhəbbət!
İndi "bir günəşin zərrəsiyik biz".
Var olsun birləşən dost əllərimiz!

*1936, 18 avqust*

## BÖYÜK ŞAİRİN ŞƏRƏFİNƏ

I

Axıtdım alnımın inci tərini,
Yanmadım ömrümün iki ilinə.
Rusiya şerinin şah əsərini
Çevirdim ilk dəfə türkün dilinə!
Bir yeni sənətlə mən də doluyam,
Ellər dünyasının ellər oğluyam.
Yuxusuz gecələr çıxdı qarşıma,
Fəqət tövşümədi bu polad sinəm.
Artıq qovuşmuşam can sirdaşıma,
Özümə bəxtiyar bir insan desəm, –
Bu səs bir şairin vicdan səsidir,
Düşünən bir qəlbin ifadəsidir.

II

Mən ki, hər gecəmi qatdım gündüzə,
Üfüqdə sönməsin ulduzum, ayım!
Sənət vadisində gəlsin üz-üzə
Sənin Tatyananla mənim Humayım.
Ey böyük sənətkar, hüzurunda mən
Bəzən utanmışam səhvlərimdən;
Neyləyim, qüdrətim zəifdir hələ,
Görüm təbiətin kor olsun gözü!
Şairim! Anladım bu gündən belə:
Böyükdür cahanda sənətkar sözü...
Məncə yaraşmayır çoxuna bu ad,
Məni bağışlasın sevgilim həyat!..

III

“Gəlişin ruhuma dərd verir, aman!..
Məhəbbət dəmidir bahar, ay bahar!
Qanımda, qəlbimdə nədənsə bu an.
Məyus və ağlayan bir həyəcan var”.

Söylə bir, şairim, bahar gələndə
Neçin pərişanlıq dillənir səndə?
Neçin gözlərini dumanlar alır,
Göz yaşın süzülür; gülümsəyərək
Səninlə birlikdə xəyala dalır
Göydəki qaraquş, yerdəki ürək...
Mən də dərdlənmişəm küskün səsindən,
Bir əsrin o qanlı faciəsindən.

IV

Oyan bir, şairim, oyan, bizə bax
Qoy öpsün alnını bizim xoş səhər;
Bu böyük günlərə arxalanaraq,
Göstər bu meydanda yeni bir hünər;
Bizim dünyamızda itməz zəhmətin,
Həyatın qəlbidir şerin, sənətin,
Bizdə şeir qədər böyükdür hünər,
Hər kiçik şairin bir hörməti var.
Hər alın tərilə yazılmış əsər
Bizim qəlbimizdə qalır yadigar...

V

Mən səni sevmişəm körpəliyimdən,
Sənsən mehribanım, sənsən ustadım!
Nə qədər bəxtiyar bir insanam mən
Ki, sənin tələbən çağrılır adım.
Mən də bir ölkənin yazan əliyəm,
Bu bayram günündə bəzənməliyəm.
Şairlər oylağı, ey əziz Vətən!
Söylə, tanışmıdır sənə Onegin?
Bilirəm Puşkini çoxdan sevirsən...
Qızın da, oğlun da əzbərdən desin:
Bizdə şeir də var, sənət də vardır!
Şairə, sənətə hörmət də vardır!..

*1936, avqust*

## ÇİNARIN ŞİKAYƏTİ

Dindi yol üstündə qoca bir çinar:
“Şairim, sənə bir şikayətim var:
Bu qoca dünyanın şahidiyəm mən...
Kölgəmdə dincəlir hər gəlib gedən.
Bağçalar gül açır yaş torpağımda.
Quşların adı var hər yarpağımda;
Mən bu yer üzünə gələndən bəri
Olmuş budaqlarım hava səngəri.
Kötüyüm dünyanın sirrilə dolu,
Dolanmış başıma karvanlar yolu;
Bağrımı doğramış min bir cahangir.
İmtahan etmişəm onları bir-bir,
Başımda oynamış yüz boranlı qış...
Sanma ki, qüdrətim, gücüm qalmamış,
Bax, ayrılmamışam öz kötüyümdən!..
Qəhrəman bir elin timsalıyam mən...
Bir kəs inciməmiş sakit dilimdən.
İnsana yaxşılıq gəlmiş əlimdən –
Yayda kölgəliyim dağlardan sərin,
Yaylağı olmuşam biçinçilərin.
Silmişəm onların alın tərini,
Sonra dinləmişəm can dəftərini.
Ağır səfərlərə çıxan hər nəfər
Tükənmək bilməyən uzun gecələr
Sığınmış qoynuma sözü var kimi.
Örtmüşəm üstünü çadırlar kimi;
Başına yağmamış nə yağış, nə qar,
Tarix yaxşılığı yaxşı salamlar!
Aylı gecələrin buludu lay-lay
Dağılıb üzünü göstərəndə ay
İşığı sallanır budaqlarımdan,
Öpür şirin-şirin dodaqlarımdan.
Bəzən də kükrəyib əsəndə külək
Coşur varlığımda polad bir ürək.

Qalın şaxlarımın xışıltısından
Zövq alır dünyanın şöhrəti insan.
Bəzən də bir sərin axşama yaxın
Ətəkli çöllərdən hey axın-axın
Qalxan dolaşalar qaqqıldaşaraq,
Dərələr keçərək, dağlar aşaraq,
Başımın üstündə dövrələr vurur,
Bir yerə sıxlaşıb, məclislər qurur.
Bu doğma quşların simfoniyasından
Zövq alır dünyanın şöhrəti insan.
Bəzən də canlanır gündüzün səsi –
Yığışır kölgəmə uşaq dəstəsi;
Azad yurdumuzun şərqilərindən
İxtiyar yaşımda zövq alıram mən...
Sərilir kölgəmə xalı-xalçalar,
“Bizdən də bəxtiyar bir nəsilmi var?” –
Deyən uşaqların körpə yaşına,
Günəşlər yurdunun vətəndaşına
Baxdıqca böyüyür gözümdə insan,
Çəkdiyim ağrılar çıxır yadımdan.
Fəqət deyirlər ki, yoldaş mühəndis
Məni bir arxasız, yurdsuz, kimsəsiz
Zənn edib, plana almışdır ki, mən
İndi çıxmalıyam öz kötüyümdən...
Demək qalmayacaq məndən yadigar.
Ancaq mühəndisə bir sualım var:
“Ömründə bir şitil, bir budaq belə,
Mühəndis əkmişmi barı əlilə
Ki, məni – bu boyda çinarı birdən
Qoparmaq istəyir durduğu yerdən?”
Mən bu şikayəti duyduqca dərin,
Dedim ki, haqlısan, qocaman çinar!
Bizdə təbiətə zülm edənlərin
Nə insan duyğusu, nə də haqqı var!

*1936, oktyabr*

## SABİRİN ŞƏRƏFİNƏ

Xəyalım bu gecə varaq-varaqdır,
Dilsiz əsrləri o yaracaqdır.
Gözümə bir qara keçmiş görünür,
Bir qara keçmiş ki, bizdən uzaqdır.

O keçmiş – gecədir, buludu lay-lay,
Yaslı gəlin kimi pərişandır ay;
Orda təbiət də qara geyinmiş,
Sonalar dərdlidir, yorğun axır çay.

Orda parçalanır, didilir vətən,
Tez düşür insanın saçlarına dən...
Orda haqq bağıran qəhrəmanların
Bir qılıncla gedir başı bədəndən.

Boy atır sünbülün, gülün möhnəti,
Sönür baxışların ilk məhəbbəti.
Hər kiçik laylada "dərdim var" deyir
Elin şirin dili, şirin söhbəti.

Solğun dodaqları ah, aman gəzir,
Ölümlər qapını çox yaman gəzir...
Böyük bir şairin dalğın xəyalı
Vətən çöllərini pərişan gəzir...

Sabir, o günləri gətirmə yada.
Dünya unutmamış səni dünyada...
Sinənə çarpdıqca kinli dalğalar
Bir qoca dağ kimi durdun dəryada.

Sən ey azadlığın səhər ruzgarı,
Sınmadı qəlbinin tərlan vüqarı.
Əsrlər dolaşıq gəlib keçsə də,
Tarix unutmayır mərd oğulları.

Uzalı getdisə dünyadan əlin,
Artıq çiçəkləndi arzun, əməlin,
İnsanın haqqını özünə verdik,
Hər duyan ürəkdə qalxdı heykəlin.

Oyanmış bu günəş, bu yer, bu insan,
Artıq nə qamçı var, nə qara zindan,
Nə matəm hıçqırır bülbülün səsi,
O da ilham alır insan ağzından,

Azaddır ellərin çiçəkli yazı,
Bu yaz danışdırır Kürü, Arazı;
Bu böyük günlərə min dastan deyir
Şairin lirası, aşiqin sazı.

Bəzəkli yurdumuz çiçək-çiçəkdir,
Hər keçən ömrümüz bir gələcəkdir,
Sənin də varlığın bir günəş kimi
Əsrlər boyunca sönməyəcəkdir!

*1936, 27 dekabr*

## GÖZÜM YOLLARDA QALMIŞDIR

Gözüm yollarda qalmışdır, xəbər yox Kür qırağından,
Usanmaq bilməyir könlüm yaşılbaşlar sorağından.

O yerlər min xəyal eylər, təbiət şerə layiqdir,
Öpər bülbül səhər tezdən gülün yaqut dodağından.

Çəmənlər, yasəmənlər göz vurub bir cilvə göstərsə,
Durar könlüm çıxar seyrə həyatın qəm otağından...

Qarayazı meşəsində Anadil adlı bir quş var,
Mənim sevdalı qəlbim tək asılmışdır ayağından.

Yolum düşsün Səlahluyə, o qəbrə diz çöküm bir də,
Anam Məhbubi yad ilə, öpüm solğun yanağından.

Aman tale! Nə möhnətmiş onun dərdi, mənim dərdim...
Bahar fəslində ayrıldı qızılgül öz budağından.

Keçər aylar, keçər illər, yaz ey Vurğun, ömür azdır,
Düşər bir gün laçın könlün şeir, sənət marağından.

*1936*

## LƏNKƏRAN ŞEİRLƏRİ

Taleyimdir ilham almaq,
Söhbət açıb, qələm çalmaq
Bizim dünya gözəlindən;
Şərbət içdim öz əlindən
Bizim yurdun – ana yurdun;
Şair! Sənmi oxuyurdun
Dünən bizə hicran dərdi?..
Yeni tarix nə göstərdi?
Aç gözünü, yaxşı bir bax!
Bu mən, bu sən gəl yarışaq.
Ellər bizə "gəlin!" deyir;
Doğma sənət, doğma şeir
Göstərəcək ölkəmizi
Qoy tanısın dünya bizi!

Mən aşiqəm gözəlliyə,
Muradıma yetəm deyə
Dolaşıram bu torpağı;
Hər budağın bir yarpağı
Hər çiçəyin bir adı var,
İnsan adlı ustadı var
Gözəlliyin bu dünyada.
Gah havada, gah dəryada
Mən sürürəm öz gəmimi.
Tapıb könül həmdəmimi,
Durub onunla üz-üzə,
Dənizlərdə üzə-üzə,
Nə yorulur, nə doyuram,
Sahillərə üz qoyuram.
Lənkəran da sahildədir;
Gördüyümü deyim bir-bir
Bu torpağın öz dilində:
Bizim Xəzər sahilində
Uzanmış bir gözəl şəhər,
Yaşıl çalır səhər-səhər.

Hər qapıda kiçik bir bağ,
Evcikləri boydan alçaq,
Fəqət sadə, fəqət təmiz;
Yorulmayır gözlərimiz
Örtüyü ağ pəncərədən;
Çox sevirəm doğrusu mən,
Bu naxışlı örtüləri.
Səhərlərin şehli təri
Aynalardan töküləndə,
Ağlayıram baxıb mən də
Bu yerlərə sevincimdən;
Bir səs gəlir öz içimdən:
Yelkənin dəyməsin daşa,
Sən də yaşa, sən də yaşa!

Ətirlidir burda bağlar,
Güzgü kimi yolları var.
Xəyallara dalan çinar,
Sıx kölgələr salan çinar
Düşündürür burda məni.
Xəyalımın ağ yelkəni
Uzaqlara qanad çalır
Gah ucalır, gah alçalır,
Qara qışdan dərs alalı
Mən də şair tək olalı.

Qoca çinar, qoca çinar!
Kötüyündə nə sirlər var...
Gah Turandan, gah İrandan
Gah o yandan, gah bu yandan
Ordu çəkib gələnlərin
Bir "dost" kimi gülənlərin
Üstünə sən kölgə saldın,
Sonra yazıq günə qaldın.
Külək vurdu çinarlığı ...
Əsib coşan rus çarlığı
Üzərinə ordu çəkdi,
O, başında bostan əkdi...

Bu gün belə durur səndə,
“Sara” adlı cəzirəndə
Generalın məzar daşı,
O qatilin kinli başı
Oynamışdı at belində.
Əyri qılınc sağ əlində
Durub kəsdi budaqları...
Bu çölləri, bu dağları
Qapladı* bir nalə səsi,
Qanlı çarın təntənəsi.
Sevincindən göyə qalxdı,
Bizə “tatar” deyib baxdı.
Biz öldürdük generalı,
Taptaladıq o medalı...
İndi onun məzar daşı
Aya qarşı, günə qarşı
Endirmişdir dik başını...
Fahişələr oynaşını.
Bu yollardan ötüb keçən,
O günlərdən bir az içən,
Yad eləyir tüpürərək,
Yoxdur ona yanan ürək!
Qoca çinar, qoca çinar,
Kötüyündə nə sirlər var!

Deyirlər ki, çox qəhrəman
Asılmışdır budağından...
Biz onların varisiyiz,
Yaşadırız onları biz.
Qoca çinar, qoca çinar,
Kötüyündə nə sirlər var!
Ölmədin sən! Yaşadın sən!
Bir ölkənin şahidisən.
Yaşamışsan burda nələr!
Qanlı-qanlı faciələr...

---
* Bürüdü

Könlüm ötən köklü bir saz,
Nə yazım ki, biliyim az...
Arif istər məni qansın,
Tarixçilər qoy utansın!
Yazılmamış tariximiz,
Tarixsizmi yarandıq biz?
Bəzən olur yazıq şair
Keçmiş günə, bizə dair
Arxivləri axtararaq,
Yığın-yığın, qalaq-qalaq
Kitablara göz gəzdirir,
Alır, baxır, seçir bir-bir.
Bir parası əfsanədir.
Baş çıxmayır bunlar nədir?
Bir parası xatirələr...
Deyil bunlar elmi əsər.
Sən də, dostum, anla bir az!
Elmi ucuz tutmaq olmaz!
O insandır, təbiətdir,
Şübhəsiz bir həqiqətdir.
Arif gərək məni qansın,
Tarixçilər qoy utansın!
Yazılmamış tariximiz
Tarixsizmi yarandıq biz?

*1936*

## BAHAR VƏ MƏN

Bahar nə xoş gəlir, ruha dad verir.
Xəyala, duyğuya qol-qanad verir;
Var olsun şerimiz, şairlərimiz! –
Hər gülə, çiçəyə təzə ad verir.

Çıxır dağ döşünə körpə quzular,
Tərlanın səsini əks edir sular.
Səhər yuxusundan ayıldır məni
Sinəmə sığmayan böyük duyğular.

Könül dinc durmayır, oynayır yenə,
Əzəldən aşiqəm həyat şerinə;
İlk dəfə oğlumun əlindən tutub
Çıxmışam səhərin tərlan seyrinə.

Ölümə can vermə ölsən baharda,
Könül müqəddəsdir, qalmasın darda;
Baharın eşqiylə çıxır yuvadan
Balası dalında qarışqalar da.

Yaşıl köynəyini geyinir meşə,
Yaxama quş kimi qonur bənövşə;
Qoy məndən dərs alsın qoca təbiət,
O da könlüm kimi gülsün həmişə.

Bahar nə xoş gəlir, ruha dad verir,
Xəyala, duyğuya qol-qanad verir;
Var olsun şerimiz, şairlərimiz! –
Hər gülə, çiçəyə təzə ad verir.

*1937, 20 aprel*

## ŞERİMİZİN AĞSAQQALI

Qoca Cambul! Ömrün boyu
Yetim gəzdin o yurtları...
Əsdi sənin ağ başından
Qara günün sərt ruzgarı.

Tamburunu çaldıqca sən
Susdu bülbül, dindi çəmən.
Bir zamanlar nə sən, nə mən
Şad görmədik dostu, yarı.

Soldu çiçək, saraldı gül,
Boyun bükdü sarı sünbül;
Yas paltarlı qoca bülbül,
Dərdli gəzdin çəmənzarı...

Bəylər içdi ağ qımızı*,
Qurdlar yedi haqqımızı.
Səhraların oğlu, qızı
Bir görmədi dünya varı.

Gecən qara, günün qara,
Batdı gözün çuxurlara;
Qaranlığı yara-yara
Sən can atdın günə sarı.

Keçən keçdi, olan oldu,
Yaman günün ömrü soldu;
Səni gördüm, sinəm doldu,
Dəmə çəkdim bizim tarı.

Tamburunun simi qoşa,
Bir taxtadır başdan-başa,
Qanad verir dağa-daşa
Ana yurdun havaları...

---

* *Kumıs* – at südü

Nə xoş gəldi ömrün yazı,
Pozulmazdır bizim yazı...
Tambur ilə telli sazı
Qabaqlaşıb çalaq barı.

Şeir yazmaq şərəf oldu,
Şeir inci, sədəf oldu.
Durna kimi səf-səf oldu
Sinəmizin söz qatarı.

Sevgi dildə şüar olsun,
Vəfasıza çox ar olsun!
Vurğun deyər: qoy var olsun
İnsanlığın ilk baharı!

*1937, 19 may*

## DARGÖZ

Belə deyirlər ki, səndə "hünər" var...
Bacaran insanın gözü dar olmaz.
Yaxşı söyləmişdir bizim atalar:
"Müxənnət adamda düz ilqar olmaz!"

Üzümə dost kimi bəzən gülürsən,
Dalda paxıllıqdan yanıb ölürsən;
Tez-tez dəyişdirmə vallarını sən,
İlandan, iblisdən aşna, yar olmaz!

Vaxtsız xoruz olub çıxırsan dama,
Səsin gülünc gəlir qanan adama;
Qəlbin çamırlıqdır, çox qırıldama,
Qurbağa səsindən qulaq kar olmaz!

Mən az görməmişəm badalaqları...
Min fırıldaq gələn o alçaqları;
Çatdı gəncliyimin bahar çağları,
Vaxtsız çiçək tökən bir bahar olmaz!

Könlümün otağı buludlardadır.
Elə zənn etmə ki, ömrüm dardadır.
Bəs sənin dərrakən, ağlın hardadır?
Tərlan oylağında qarğa, sar olmaz!

Get, get, gözlərimə görünmə bir də,
Mənim oylağımdır bu göy də, yer də;
Sən ayaq döyürsən qaldığın yerdə,
Yerində sayandan sənətkar olmaz!

*1937, 19 may*

## BÜLBÜL

Bülbül! Səhər-səhər qonaq budağa,
Günəşin eşqinə bir dastan qoşaq!
Ötək bağçamızda dodaq-dodağa,
Yarpaq inciməsin, əyilməsin şax,
Günəşin eşqinə bir dastan qoşaq!

Seyr et bu varlığı, şeyda bülbülüm!
Həyata müjdədir hər yeni bəstən;
Bağrının başında qalmamış zülüm,
Sən də insan kimi çıxdın qəfəsdən,
Həyata müjdədir hər yeni bəstən.

Bülbülüm, köksünün altı sarıdır,
Mehriban yaratmış səni təbiət;
Bu torpaq bülbüllər laləzarıdır;
Gözəldir səndəki bu söz, bu sənət,
Mehriban yaratmış səni təbiət..

Özün bilirsən ki, mən gözəlliyə
Əzəldən vurğunam... Gözəl-həyatdır!
Azadlıq, qurtuluş bizdədir deyə,
Hər yeni istəyin bir kainatdır,
Sevdiyim gözəlin adı həyatdır.

Gəl, şeyda bülbülüm, verək səs-səsə,
Qardaşlıq adına min söhbət açaq.
Deyək şərqimizi nəfəs-nəfəsə,
Hər sözün başında bir sənət açaq;
Qardaşlıq adına min söhbət açaq.

*1937, may*

## BƏNÖVŞƏ

Yazın novbarısan bizim diyarda,
Qıvrım tellərini sana, bənövşə!
Mən səni sevmişəm bir ilk baharda,
Könlümü vermişəm sana bənövşə!

Sənsən əzəl gündən mənim sirdaşım.
Gözümdən ayrılsan, axar göz yaşım,
Gövdəmin üstündə durmayır başım
Buranda boynunu yana, bənövşə.

Çıxmışam seyrinə meyli, məzəli,
Heyrandır hüsnünə ellər gözəli;
Könlüm oylağını yaxın gəzəli
Çoxları küsəndi mana, bənövşə!

Üzündə gördüyüm nə intizardır!
Qəlbində Vaqifin sirrimi vardır?
Gəl ondan söz açma, indi bahardır.
Bağrımı döndərmə qana, bənövşə!

Boynunu kəc burma gəl indən belə,
Mən sənə söz qoşum, sən məni dinlə:
Vurğunun şerilə, sənin hüsnünlə
Təbiət gələcək cana, bənövşə!

*1937, 1 iyul*

## SƏHƏR-SƏHƏR

Səhər-səhər seyrə vardım qızıl gülün yanağını,
Açdı könlüm şirin-şirin nəğməli ney dodağını.

Ey ariflər, nəzər salın təbiətin qurğusuna,
Şeyda bülbül kəsərmi heç gül yanından ayağını.

Səhər qumral saçlarını yayan günəş sirdaşımdır,
Axşam üstü çox öpürəm ayın açıq qabağını.

Əzəl gündən aşiqiyəm mən bu günün, bu varlığın,
Bütün dünya bizdən alır səadətin sorağını.

Sən ey mənə şeir yazıb "neçin susdun" deyən şair,
Mən qapalı görməmişəm könlümün söz otağını.

Böhtanını geriyə ud! Əriyərsən bir sözümdən,
Yazıb-yazıb dolduraram sinəmin ağ varağını.

Qara bulud sallamasın ətəyini sərhəd boyu,
Mən dünəndən doldurmuşam patronumun darağını.

Sabahkı hərb meydanında bir əsgərəm, bu bəllidir,
Hər bir sözüm saldıracaq min faşistin yarağını.

Böyük Vətən bir nəfəslə qalxacaq bir çekist kimi,
Tülkülərə verməyəcək aslanların yatağını.

O gün mən də ilhamımla oxşayaraq sevəcəyəm
At belində qılınc vuran Don çayının qazağını.

*1937, avqust*

## DANIŞAQ

Aşıq, bağrına bas sədəfli sazı,
Min cavablı bir sualdan danışaq;
Meydan quraq, söhbət açaq, saz tutaq,
Gül yanaqlı qoşa xaldan danışaq.

Qoy söz alım bir günahsız dodaqdan,
Düşmən baxıb həsəd çəksin uzaqdan;
Yar bəzənib çıxan zaman otaqdan,
Başındakı güllü şaldan danışaq.

Vurğun deyər: bir dərd bilən yar olsun,
Zülfü bulud, ağ sinəsi qar olsun,
Yaxşı gündə, yaman gündə var olsun,
Qədir bilən əhli-haldan danışaq.

*1937, avqust*

## BÜLBÜL VƏ BAĞBAN

Gözəl bir bağçada bir bülbül vardı,
Budaqdan-budağa uçub qonardı.
Onun yuvasıydı gülün yarpağı,
Dilindən düşməzdi vətən torpağı.
Güllər boy atardı onun səsiylə
Çiçəklər yatardı xoş nəfəsilə.
Bülbül bu gülşəndən ilham alardı,
Gündə şadlığından qanad çalardı
Baxıb hər çiçəyə, hər qərənfilə
Şərqilər deyərdi o gülə-gülə.

Bu bağın, bağçanın sahibi bağban
Bülbülü eşq ilə dinlərdi hər an.
Hər bir şərqisini duyub dərindən,
Zövq alardı onun nəğmələrindən.
O dünya görmüşdü, bilirdi əlbət,
Bir ölməz qüvvədir cahanda, sənət.
Bilirdi sənətin, şerin qədrini,
Dinləmək istərdi gündə birini.
Bilirdi nəğməsiz keçən bir ömür
Bir gülşən olsa da, viran görünür...
Gəlib söyləyirdi hər gün bülbülə:
"Səhərdir yenə coş, yenə gəl dilə,
Eşitsin səsini ellər, obalar,
Oxu, yurdumuzun ağ günləri var;
Bu torpaq, bu hava sənə tanışdır,
Qəlbinin simini tez-tez danışdır".

Bülbül bu rəftardan qüvvət alardı,
Qəlbini saz kimi tutub çalardı.
Baxaraq güllərin ilk qönçəsinə,
Söz verərdi könül kəmənçəsinə.
Bağban deyərdi ki: "El bəxtiyardır
Bizim də bağçanın bülbülü vardır".

Günlərin birində bağın yanından
Bir atlı oğrunca keçdiyi zaman
Bülbülün səsinə uyaraq durdu,
O gün şeyda bülbül xallar vururdu.
Atlı çox dinlədi quşun səsini,
Bir aydın səhərin nəşidəsini,
Ah, dedi, nə gözəl oxuyur bu quş
Könlüm ləhcəsinin əsiri olmuş...
Dayan bir fənd qurum indi bülbülə;
Onu bir dost kimi tutaraq dilə
Burdan öz bağıma uçuram gərək,
Yoxsa partlayacaq sinəmdə ürək.

Atlı bu niyyətlə keçib irəli,
Dedi: "Bülbül qardaş, illərdən bəri
Sənin sənətinə heyranam inan,
Könlüm ayrılmamış bir gün yanından.
Nə gözəl, nə şirin avazın vardır,
Bu bağın bağbanı nə bəxtiyardır.
Fəqət bilirsənmi başında nə var?
Sənə həsəd çəkən ala qarğalar
Şikayət eyləmiş sizin bağbana
Adını salmışdır qara böhtana.
Tez ol, öz başının çarəsini qıl,
Təbiət sənə də vermişdir ağıl.
Gəl, atıl çiynimə gedək uzağa,
Bu gündən bülbül ol sən bizim bağa.
Gedək, çox gözəldir söylədiyim bağ,
Sənin yuvan olsun hər yaşıl yarpaq.
Yoxsa günün burda qara keçəcək,
Bir tikan olacaq sənə hər çiçək"

Qabardı tükləri şeyda bülbülün,
Dedi: "Aşiqiyəm bu doğma gülün,
Bu bağlar, bağçalar, ellər mənimdir
Bunlar öz vətənim, öz vətənimdir.
Doğma oylağımdır bu daş, bu torpaq,
Anamdır, yuvamdır bu gül, bu yarpaq.

Mən burdan almışam şeri, ilhamı,
Andıma, əhdimə şahiddir hamı.
Azaddır ilhamım, azaddır səsim,
Mən burdan ayrılsam, donar nəfəsim.
Get alçaq! Dediyin böhtandır mana,
Doğma balasını atarmı ana".

Atlının ağzında kəsildi sözü,
Kinindən qızardı fitnəkar gözü.
Çəkdi qamçısını başı aşağa,
Bülbül qanad çalıb qalxdı budağa.
Atlı dayanmadı, qoşdu bağbana
Dedi: "Ağlayıram sənin halına
Budur, bax, tökülür yanağıma yaş.
Başına çarə qıl, a bağban qardaş.
Sənin bağındakı bu bülbül ki var,
Sinəmə çəkmişdir çal-çarpaz dağlar.
Bir zaman o bizim bağda yaşardı,
Səhərlər çox şirin ləhcəsi vardı.
Mən də sənin kimi sevərdim onu,
Bilməzdim bəduğur quş olduğunu.
Bir gün çiçəklərim, güllərim soldu,
Ömrümün sarayı pərişan oldu.
Qurudu bağdakı şitil tənəklər,
Kökündən ayrıldı tazə çiçəklər.
Bu dərdi mən kimə söyləyim deyə,
Diz çöküb yalvardım o dilsiz göyə.
Həkimlər, loğmanlar yığıldı dərhal
Bu dərdin sirrini mən etdim sual;
Axtarıb, düşünüb, fikirləşdilər,
Nəhayət, verdilər belə bir xəbər:
Görünür, bu bağda yaşayan bu quş
Anadan olalı bəduğur olmuş.
Tez axtar, onu tap, uçur bu bağdan,
Qoy səsi, nəfəsi gəlsin uzaqdan.
İndi haman bülbül sizə dadanmış,
Özüylə hər yaza gətirir bir qış.

Özünü sevdirir xeyli zamandır,
Ayağı bəduğur, cinsi yamandır.
Qovun birdəfəlik bu bağdan onu,
Yoxsa qış olacaq bu yayın sonu".

Bağban dünya görmüş bir arif idi,
Atlını aldadıb "yaxşı, get", – dedi.
Sonrasa bülbülün gəldi yanına
Bu gülünc nağılı danışdı ona.
O dedi: "Bülbülüm, inanıram mən,
Şirin nəğmələrin qopur ürəkdən.
Sən sudan durusan, aydan da arı,
Könüldən sevirsən bizim gülzarı.
Yüz yalan qussa da hər gəlib-gedən,
Yenə də çal-çağır öz yuvanda sən.
Bülbül qanad çalıb, sevindi yenə,
Söz verdi qəlbinin yumşaq telinə.

Körpə bir oğluyam şerin, sənətin,
Sinəm meydanıdır sözün, söhbətin.
Başımda tutmuşam bir günəş kimi
Böyük bayrağını əbədiyyətin.

Hər təmiz ürəyin ötən səsiyəm,
Bu bağın, bağçanın ilk qönçəsiyəm.
Ellər bayramının, ellər toyunun
Əllə çalınmayan kəmənçəsiyəm.

Karvanım yol alıb gedir bir başa
Ömrümdə yelkənim dəyməmiş daşa.
İşığa qardaşam, zülmətə düşmən,
Xəyalım günəşlə durur baş-başa.

Mən ilham almışam axar sulardan,
Könlüm ayrılmamış ilk arzulardan.
Kəsilməz ayağı şeyda bülbülün
Al geyib bəzənən güllü bahardan.

Könül hər çiçəyə istər yar olsun,
Bir bahar içində min bahar olsun.
Mən ki nəğmələrçin yaradılmışam,
Eşqim, səadətim, haqqım var olsun.

Körpə bir oğluyam şerin, sənətin
Sinəm meydanıdır sözün, söhbətin.
Başımda tutmuşam bir günəş kimi,
Böyük bayrağını əbədiyyətin.

*1937, 2 sentyabr*

## BİR ARZU

*Osman Sarıvəlliyə*

Yenə şeirlərin qarşımdadır, bax,
Sənin kitabçanı varaqlayaraq.
O qara keçmişi xatirə saldım.
Hər sözün üstündə xəyala daldım...

Həqiqət! Anası budur sənətin.
Boğazdan yuxarı bir məhəbbətin
Soyuq saçmaları şeir yaratmaz...
Səninsə qəlbində ötən telli saz
Bizə dünyamızdan bir yadigardır,
Şerində çırpınan bir ürək vardır.
Bu bizə bəllidir!
                                        Fəqət, qardaşım!
(Sən ey bu dünyada yalnız sirdaşım)
Düşünən alnının isti tərindən,
Ömrünün yuxusuz gecələrindən
Hər ayın başında bir dastan yarat,
Yazan əllərinlə bəzənsin həyat!
Özün bilirsən ki, yaradan ölməz...
Nə var bu dünyada qələmə gəlməz?!
Atıl dalğaların qucağına tək,
Bil ki, cəsarətlə vuran bir ürək
Şaşırmaz yolunu...
                                        Bəllidir bizə!
Cəsarət yaraşır gənc nəslimizə.
İstərəm yazdığın hər böyük əsər
Bizə yer üzündən versin min xəbər...

*1937, 15 oktyabr*

# BAYRAM QABAĞI

Yenə baxır gülərüz ay pəncərəmdən xumar-xumar,
Yatma, – deyir bu gün mənə sinəmdəki bu duyğular.
Bayram gəlir: "Bəzən" deyə sevindirir könül məni;
Baş götürüb uçur yenə xəyalımın ağ yelkəni
Azad baxan gözlərimdən səadətlər aşıb daşır,
Bəxtiyardır mənim ömrüm – ağ günlərlə qucaqlaşır.
Hey baxıram yurdumuzun dastan olmuş cəlalına,
Dağlar, daşlar qanad verir bir şairin xəyalına...
Otuz illik gəncliyimin dəftərində yoxdur qara,
Könlüm quşu qanad çalıb qalxır o ağ buludlara.
Mən açmışam vicdanımın kitabını varaq-varaq,
Öz qəlbini duyacaqdır ellər onu oxuyaraq.
Bayram gəlir, bəzən deyə sevindirir könül məni,
Baş götürüb uçur yenə xəyalımın ağ yelkəni.

İnsan oğlu bir ömürlük sıxıntıdan qurtulalı,
Səhərlərə müjdə verir hər vicdanın istiqlalı.
Həyat dərin, nəşə dərin, könül dərin, duyğu dərin,
Mən saz tutub şeir yazan aşiqiyəm bu günlərin.
Ey səhərin ətir saçan, layla deyən sabah yeli!
Sən mehriban ana kimi oxşadıqca bizim eli
Gözlərimdən qüvvət alır quş qonmayan dağlar başı,
Dostlar, gəlin bu dağlardan, bu düzlərdən bir də keçək,
Əsrlərcə susuz çöllər açılmışdır çiçək-çiçək;
Nə zindan var, nə yumruq var, nə aclıq var, nə də zülüm,
Qapılardan duman kimi çəkilmişdir vaxtsız ölüm.
Al günəşin baxışından ərimişdir qara qışlar,
Min bahardan müjdə verir bizim körpə qaranquşlar,
Ömrü, günü yasda keçmiş ağ birçəkli yazıq qarı
Gəlin kimi sığal vurub seyrə çıxır bulaqları.
Ürəklərin məhəbbəti, səadəti gözdən aşır,
Bizim yerdə keçən həyat qocaldıqca cavanlaşır.
Yeddi oğul, ya qız doğan bizim sağlam analardır,
İndi bildim analığın nə müqəddəs haqqı vardır.

Al qumaşa bəzənmişdir bu dağların gözəlləri,
Sağ olsaydı, ağlamazdı Füzulinin qəzəlləri.
Azad nəğmə, azad könül yurdumuzun şöhrətidir,
Bunlar bizim qanunların insanlara hörmətidir.
Enin yerə, saf ulduzlar, halqa vurun dörd yanımda,
Al günəşin istisi var mənim təmiz vicdanımda.
Bizim şanlı dünyamızda nə ağa var, nə də ki, qul;
Qazaxıstan çöllərində şeir yazır qoca Cambul
Dağıstanlı Süleymanı – o ağ saçlı aşiqi biz
Gündə yeni nəğmə qoşan bülbül kimi dinləyiriz.
Azərbaycan dağlarından sular içmiş körpə Vurğun
Kiçik-kiçik şeir yazan bir oğludur ana yurdun.

Nədir bizim ömrümüzün şərbət kimi şirin dadı?
Nədir bizim çaldığımız havaların böyük adı? –
Bu ad dillər dastanıdır, ürəklərin bayrağıdır,
Gündüzlərin günəşidir,gecələrin çırağıdır.

*1937, 28 oktyabr*

## ÖMRÜMÜN GÜNDƏLİYİNDƏN

Bu gün qızcığazım Aybənizlə mən
Göz-gözə baxışıb güldük ürəkdən.
Yaxşı demişlər ki, şirindir bala,
Bizə çəkdirsə də min dərd, min bəla.
Yenə bu varlıqda nə hikmət varsa,
Azacıq yel əsib rəngi saralsa,
Min sızıltı qopur ürəyimizdən.
Cəbhələr tanımış möhkəm bir bədən
Belə yarpaq kimi titrəyir, əsir,
Qəlbi şaxta vurur, üşütmə kəsir.

Gözümü zillədim gözünə bir az,
Özü də bilmədən güldü qızcığaz,
Sanki tanımışdır atasını, bax!
O, bir pişik kimi xumarlanaraq
Nazlanmaq istəyir qucağımda tək,
Sanki dağa dönür sinəmdə ürək!

Ah, mehriban balam, günahsız quzum.
Çoxdan istədiyim mənim ilk qızım.
Sənin çocuqluğun bizdən bəxtiyar,
Nə çörək dərdi var, nə su dərdi var.
Azad yurdumuzun bir çiçəyisən,
Sən şaxta vurmamış güllər təkisən.
Anamın boyunu görüm boyunda,
Əl çalıb oynayım sənin toyunda.

*1937, oktyabr*

## BÖHTAN

Mənmiyəm “vicdanı, məsləki satan”?
Yaxamdan əl çəksin bu qara böhtan.
Ellərin bağında ötən bir quşam,
Bir az da vaxtından tez doğulmuşam...
Könüldən demişəm, deyirəm bunu!
Töhmət almamışam ömrüm uzunu.
İndi bu böhtanlar mənə dar gəlir,
Saçlarım ağarır ömrüm gödəlir.
Qapımdan çəkilsin qara buludlar,
Mənim günəş adlı bir vicdanım var.

*1937, 6 noyabr*

## MÜNDƏRİCAT

